# KƏHRƏBA ŞƏHADƏT GÜNƏŞİ

İslam İnqilabının Böyük Rəhbəri Cənab Ayətullah Xameneinin çıxışlarından seçmələr

# Mündəricat

**KƏHRƏBA**

**Kitab haqqında**

ŞƏHADƏT GÜNƏŞİ

İslam İnqilabının Böyük Rəhbəri cənab Ayətullah Seyid Əli Xameneinin çıxışlarından seçmələr


Kitabın adı:........................................Kəhrəba

Tərtib edən:....................................Hadi Ülya

Tərcümə edən:...........................İbrahim Mirzə

Nəşr edən:.................................Üfüqe-fərda

Çap tarixi:..................................................٢٠١٣

Çap növbəsi:........................................Birinci

Tiraj:.........................................................٣٠٠٠

səh:١


**Ön söz**

**İşarə**

.Söhbət Allah liqasından və Allahla görüşdən gedir

İnsanın yaranmasının, “Sən (ölənə qədər) Rəbbinə doğru çalışıb çapalayırsan“ “!sözünün, bütün bu fəaliyyət və zəhmətlərin məqsədi budur: “Sən Ona qovuşacaqsan

Əgər kimsə Allah liqasını vətən seçmişsə, bizimlə gəlsin”, Hüseynlə (ə) birgə yola !düşsün, evdə oturmaq olmaz

Dünyadan və dünya nemətlərindən yapışmaq və Hüseyn (ə) yolundan xəbərsiz !qalmaq olmaz

.Yola düşməliyik

Bu yola düşmək bizim daxilimizdən, nəfsimizdən və nəfsin paklığı ilə başlayır, sonra .cəmiyyətə və dünya miqyasına çatır

.Məhərrəm ayı ərəfəsində ruhani və vaizlərlə görüşdəki çıxışdan: ۱۹۹۵

.Hüseyn ibn Əlinin (ə) adı qəribə addır

Duyğusal baxımdan yanaşdıqda görürsünüz ki, o imamın adı inanclı müsəlmanların .qəlbini maqnit və kəhrəba kimi özünə cəzb etmək xüsusiyyətinə malikdir

Düzdür, müsəlmanların arasında buna malik olmayanlar və əslində İmam Hüseyn (ə) inancından bəhrəsiz qalanlar var. Digər tərəfdən, bu ailənin şiələri sayılmayan şəxslər də var. Lakin onların arasında elələri də var ki, Hüseynin (ə) adı gözlərini yaşardır, qəlblərini coşdurur. Allah-Taala İmam Hüseynin (ə) adına elə təsir bəxş etmişdir ki, bu ad çəkiləndə biz İran xalqının və digər şiə xalqların ürəyinə və canına mənəvi bir hal hakim olur. Bu o müqəddəs adın duyğusal mənasıdır. Əvvəldən də agah insanlar arasında belə olmuşdur. Rəvayətlərdən, tarixdən və əsərlərdən anlaşılana əsasən, əziz Peyğəmbərin (s) və Əmirəl-mömininin (ə) evində, onların yaşadığı yerdə bu əziz varlıq bu xüsusiyyətə malik olmuş, ona məhəbbət və eşq bəslənmişdir. Bu gün də .belədir

İslam İnqilabının Böyük Rəhbəri və Ali Baş Komandanın Keşikçi Günü münasibəti ilə ,İslam İnqilabının Keşikçilər Korpusunun komandirləri, məsul işçiləri və şəxsi heyəti

.həmçinin polislər və İslam inqilabı əlilləri ilə görüşündəki çıxışından: ۱۹۹۵

İnsan vacib əməli və vəzifəni yerinə yetirməlidir. Lakin bu iş böyük bir problemə, misal üçün, bir çoxlarının öldürüləcəyinə bais olsa, daha vəzifəsi olmadığını düşünür. Siz görün İmam Hüseynin (ə) qarşısında hər bir yaxıngörən insanı yoldan saxlaya bilən belə şəriət üzrləri nə qədər olmuşdur; biri o birindən sonra qarşıya çıxırdı. Əvvəlcə Kufə xalqının üz çevirməsi və Müslimin öldürülməsi hadisəsi baş verdi. Fərz edək burada İmam Hüseyn (ə) buyurmalı idi ki, bu, şəriət baxımından üzrlü səbəbdir və vəzifə boynumuzdan götürülür. Biz istəyirdik Yezidlə beyət etməyək, amma bu vəziyyətlə mümkün deyil, xalq da dözmür. Deməli, vəzifə götürülmüşdür və məcbur .qalıb beyət etməliyik

Böyük Rəhbərin İmam Xomeyninin məqbərəsindəki izdihamlı toplantıda çıxışından: .۱۹۹۶

Aşura sırf tarixi hadisə deyildi. Aşura bir mədəniyyət, davamlı bir düşüncə və İslam .ümməti üçün daimi örnək idi

Həzrət Əbu Abdullah (ə) öz dövründə tam aydın əqli və məntiqi izahı olan bu hərəkəti .ilə İslam ümməti üçün bir nümunə yazıb qoydu

.Bu nümunə təkcə şəhid olmaq deyil, mürəkkəb və çox dərin bir şeydir

:Həzrət Əbu Abdullahın (ə) hərəkətində üç element vardır

,Məntiq və ağıl

,Qəhrəmanlıq və izzət

.Duyğu

İslam İnqilabının Böyük Rəhbərinin məhərrəm ayı ərəfəsində ruhani və təbliğatçılarla .görüşdəki çıxışından: ۲۰۰۶

Bu hərəkətdə məntiq və ağıl elementi o həzrətin, bu hərəkətin başlanmasından öncə Mədinədə olduğu zamandan

şəhidlik gününə qədərki sözlərində görünür. Bu nurlu kəlamların hər bir cümləsi möhkəm bir məntiqi bəyan edir. Bu məntiqin xülasəsi odur ki, şərait mövcud və münasib olduqda müsəlmanın vəzifəsi addım atmaqdır; bu addımın ən yüksək mərhələlərdə təhlükəsi olsun, yaxud olmasın. Ən böyük təhlükə odur ki, insan özünün və əzizlərinin canını, özünün yaxın namuslarını – həyat yoldaşını, bacısını, övladlarını və qızlarını ixlasla meydana aparsın və əsirliyə məruz qoysun. Bunlar çox təkrar olunduğundan bizə adi görünür, halbuki bu sözlərin hər biri oyadıcıdır. Odur ki, hətta bu həddə təhlükə olmasa da, bu xəttə münasib addım üçün şərait mövcud olduqda insan addım atmalı və dünya onun qarşısını almamalıdır; nəyisə nəzərə almaq və mühafizəkarlıq insana mane olmamalıdır; fiziki ləzzət, rahatlıq və asayiş insanın yolunu kəsməməlidir. İnsan hərəkət etməlidir. Əgər hərəkət etməsə, deməli, onun imanının və İslamının sütunları yerində deyil. Həqiqətən Allahın Rəsulu belə buyurub: "Kim Allahın haramını halal edən zalım bir hökmdarla üzləşsə, lakin əməli və sözü ilə ona etiraz etməsə, Allahın haqqıdır ki, bu şəxsi də o zalımı daxil etdiyi yerə (cəhənnəmə) daxil etsin". Məntiq budur. Dinin bünövrəsi təhlükəyə düşdükdə siz bu təhlükəli hadisənin qarşısında sözlə və işlə müdaxilə etməsəniz, (sizin kimi) məsuliyyətsiz və öhdəliksiz insanı qarşı tərəfin – yəni həmin hegemonun və zalımın .vəziyyətinə düçar etmək Allahın haqqıdır

İslam İnqilabının Böyük Rəhbərinin məhərrəm ayı ərəfəsində ruhani və təbliğatçılarla .görüşdəki çıxışından: ۲۰۰۶

Hüseyn ibn Əli (ə) bu işin aqibətini bilirdi. Belə düşünmək olmaz ki, o həzrət hakimiyyətə – sözsüz ki, o hakimiyyətin məqsədi müqəddəsdir – gəlmək üçün gözlərini bağlayıb hərəkət etdi. Xeyr, bir ziyalınüma baxışın bizi buna çəkməsinə əsla lüzum yoxdur. Xeyr, dəqiq hesablara əsasən və imamətə xas aydın baxışla bu yolun aqibəti (İmam Hüseynə (ə) bəlli idi. Lakin məsələ o qədər əhəmiyyətlidir ki, Hüseyn ibn Əli (ə

kimi qiymətli bir şəxs bu məsələ ilə rastlaşdıqda öz canını ixlasla meydana aparmalıdır. Bu, qiyamətə qədər bütün müsəlmanlara aiddir. Buna əməl də olunmuşdur, yalnız nümunə göstərmək üçün yazı lövhəsinə yazılan və sonra pozulan bir dərs olmamışdır. Bu, İslam tarixinin alnında ilahi rənglə qeyd olundu; çağırdı, cavab aldı, bu günə qədər .də alır

İslam İnqilabının Böyük Rəhbərinin məhərrəm ayı ərəfəsində ruhani və təbliğatçılarla .görüşdəki çıxışından: ۲۰۰۶

İkinci element qəhrəmanlıqdır. Yəni lazım olan bu mücahidlik gərək İslam izzəti ilə edilsin. Çünki izzət Allaha, onun Rəsuluna (s) və möminlərə məxsusdur. Müsəlman həmin hərəkətdə və mücahidlikdə də özünün və İslamın izzətini qorumalıdır. Məzlumluğun zirvəsində də çöhrəyə baxsan, qəhrəman və izzətli bir çöhrədir. Əgər öz müasir tariximizin müxtəlif siyasi və hərbi mübarizələrinə baxsanız, görərsiniz ki, hətta əlinə tüfəng alıb fiziki müharibəyə atılanlar da bəzən özlərini alçaltmışlar. Lakin Aşura məntiqində belə bir şey yoxdur. Hüseyn ibn Əli (ə) bir gecə möhlət aldıqda da izzətlə möhlət alır, "kömək edən varmı?" - deyə yardım istəyəndə də izzət və iqtidar mövqeyindən deyir. Mədinə-Kufə yolunda müxtəlif insanlarla rastlaşdıqda, onlarla danışdıqda və bəzilərindən kömək istədikdə də zəiflik və gücsüzlük mövqeyindən istəmir. Bu da başqa bir dəyərli elementdir. Bu element Aşura yolçularının öz proqramlarında yerləşdirdikləri bütün mücahidliklərdə nəzərə alınmalıdır. Bütün mücahid hərəkətlər – istər siyasi, istər təbliğat, istər canını fəda etməyin lazım olduğu .hərəkətlər izzət mövqeyindən olmalıdır

İslam İnqilabının Böyük Rəhbərinin məhərrəm ayı ərəfəsində ruhani və təbliğatçılarla .görüşdəki çıxışından: ۲۰۰۶

:Aşura günü Feyziyyə mədrəsəsində imamın simasına baxın

Nə silahlı əsgəri, nə bir gülləsi olan ruhani elə izzətlə danışır ki, onun izzətinin ağırlığı .düşmənin dizini qatlayır

:Bu, izzət mövqeyidir. İmam həmişə belə idi

.Tənha, yalqız, dəstəsiz, lakin izzətli

.Bu bizim Böyük İmamımızın siması idi

Allaha şükür edək ki, biz bu zamanda yaşadıq. Allah dəfələrlə və illərlə dediyimizin, oxuduğumuzun və eşitdiyimizin real nümunəsini gözlərimiz önündə göstərdi. Biz öz .gözlərimizlə onu gördük. O bizim Böyük İmamımız idi

İslam İnqilabının Böyük Rəhbərinin məhərrəm ayı ərəfəsində ruhani və təbliğatçılarla .görüşdəki çıxışından: ۲۰۰۶

Üçüncü element duyğudur. Yəni həm hadisənin özündə, həm də davamında duyğu təyinedici bir rol yaratmışdır. Bu, Aşura və şiə cərəyanı ilə digər cərəyanlar arasında sərhədin yaranmasına bais oldu. Aşura hadisəsi quru və yalnız məntiqi hadisə deyil, onda eşqlə, məhəbbətlə, rəhmlə və ağlamaqla yanaşı olan emosiya da var. Emosiyanın gücü böyükdür. Odur ki, bizə ağlamağı, ağlatmağı və hadisəni izah etməyi tapşırırlar. Zeynəb-Kübra (ə) Kufə və Şamda məntiqli danışır, lakin mərsiyə oxuyur; İmam Səccad (ə) Şamda minbər üzərində elə qüdrətlə və möhkəm şəkildə Əməvi hakimiyyətinin başından vurur, lakin mərsiyə oxuyur. Bu mərsiyəxanlıq bu günədək davam edir və əbədi olaraq davam etməlidir ki, emosiyalar cəlb olunsun. Emosional mühitdə, eşq və məhəbbət vadisində digər yerlərdə anlaşıla bilməyən çoxlu .həqiqətləri anlamaq olar

İslam İnqilabının Böyük Rəhbərinin məhərrəm ayı ərəfəsində ruhani və təbliğatçılarla .görüşdəki çıxışından: ۲۰۰۶

İran xalqının böyük inqilabında da Aşuranın, Hüseyn ibn Əlinin (ə) və məhərrəm hadisələrinin xatirəsinin əsaslı rolu vardır. Aşura mövzusu tükənməyən və əbədi bir .mövzudur

Bu hadisə nə üçün İslam tarixində bu qədər böyük təsirlər qoymuşdur? Mənim fikrimcə Aşura məsələsi ona görə qeyri-adi əhəmiyyətə malikdir ki, bu hadisədə olan fədakarlıq və candan keçmək müstəsna bir fədakarlıqdır. İslam tarixinin əvvəlindən bu günədək həmişə müharibələr, şəhadətlər və fədakarlıqlar olmuşdur. Biz də öz dövrümüzdə mücahidlik edən, canından keçən və çətin şəraitə dözən çox insanlar görmüşük. Bizim bütün bu şəhidlərimiz, bütün bu əlillərimiz, əsir düşənlərimiz, onların ailələri və inqilabdan sonrakı illərdə, yaxud inqilab dövründə fədakarlıq edən digər şəxslər bizim gözümüz önündədirlər. Keçmişdə də belə hadisələr olmuşdur; tarixdə oxumusunuz. Lakin bu hadisələrin heç biri Aşura hadisəsi ilə müqayisəolunası deyil; hətta Bədr, Ühüd və erkən İslam çağının şəhidlərinin şəhadəti də. İnsan fikirləşəndə bizim bir neçə imamımızın dilindən şəhidlər ağasına müraciətlə "sənin (faciəli) günün .kimi heç bir gün yoxdur" – sözünün nə üçün deyildiyini anlayır

İslam İnqilabının Böyük Rəhbərinin məhərrəm ayı münasibətilə xalqın müxtəlif .təbəqələrilə görüşdəki çıxışından: ١٩٩٢

Aşura hadisəsinin əsas məğzi budur ki, hər yeri zülmətin, fəsadın və zülmün bürüdüyü bir dünyada Hüseyn ibn Əli (ə) İslamı xilas etmək üçün qiyam etdi və bu böyük dünyada heç kəs ona kömək etmədi. Hətta o həzrətin dostları, yəni hər biri bir cəmiyyəti bu meydana və Yezidlə mübarizəyə çəkə bilən şəxslər bəhanə ilə meydandan çıxdılar və qaçdılar; İbn Abbas bir cür, Abdullah ibn Zübeyr bir cür, səhabə və tabelərdən olan digər böyüklər də bir cür. Məşhur və adlı-sanlı şəxsiyyətlərin, təsir göstərə bilən və mübarizə meydanını qızışdıra bilən şəxslərin hər biri bir cür meydandan çıxdılar. Danışanda hamısı İslamı müdafiədən danışırdılar, lakin növbə əmələ çatdıqda gördülər ki, Yezidin hökuməti qəddar hökumətdir, rəhm etmir, sərt tədbirlərə qərar vermişdir. Odur ki, hər biri bir tərəfə qaçıb İmam Hüseyni (ə) tənha qoydular. Hətta öz işlərini üzrlü göstərmək üçün Hüseyn ibn Əlinin (ə) yanına gedib o .həzrətə israrla deyirdilər ki, ağa, siz də qiyam etməyin, Yezidlə müharibəyə girişməyin

.Bu, tarixin qəribə bir ibrətidir

İslam İnqilabının Böyük Rəhbərinin məhərrəm ayı münasibətilə xalqın müxtəlif .təbəqələrilə görüşdəki çıxışından: ١٩٩٢

Böyüklərin qorxduğu yerdə, düşmənin çox qəddar simasını göstərdiyi yerdə, hamının, meydana qoşulacağı təqdirdə qərib meydanın onları udacağını hiss etdiyi yerdə, insanların içinin və daxilinin tanındığı yerdə, o zamanın olduqca çoxlu əhalisi olan bütün İslam dünyasında – bu böyük bir dünya idi, bu gün müstəqil və ayrı olan çoxlu müsəlman ölkələr o zaman bir ölkəni təşkil edirdilər – düşmənin qarşısında .dayanmağa qərar verən, buna iradəsi və cürəti çatan şəxs Hüseyn ibn Əli (ə) idi

İslam İnqilabının Böyük Rəhbərinin məhərrəm ayı münasibətilə xalqın müxtəlif .təbəqələrilə görüşdəki çıxışından: ۱۹۹۲

Bu məzlumluqdur. Bu məzlumluq kiçilmə və alçalma deyil. İmam Hüseyn (ə) İslam tarixinin ən əzəmətli mübarizi və mücahididir. Çünki o belə bir meydanda dayandı, qorxmadı və cihad etdi. Lakin bu böyük insanın əzəməti qədər məzlumluğu da var. O, böyük olduğu qədər məzlumdur da. O, qürbət içərisində şəhadətə qovuşdu. Döyüş meydanına gedən, xalqın şüar dediyi, tərifədiyi, ətrafını özü kimi qəhrəman insanların əhatə etdiyi, yaralanacağı, yaxud şəhid olacağı təqdirdə xalqın onunla necə eşqlə rəftar edəcəyini bilən fədakar əsgərlə və dəliqanlı insanla qürbətdə, zülmətdə, tənha, köməksiz, xalq tərəfindən heç bir yardıma ümidi olmayan halda və düşmənin geniş təbliğatına rəğmən, dayanan, mübarizə aparan, Allahın qəza və qədərinə razı və Allah yolunda öldürülməyə hazır olan şəxs arasında fərq var. Kərbəla şəhidlərinin əzəməti bundadır. Onlar Allah və din yolunda cihaddan ibarət olan vəzifə hissi üçün düşmənin əzəmətindən qorxmadılar, öz tənhalıqlarından

vahiməyə düşmədilər, saylarının az olmasını düşmən qarşısında qaçmağa səbəb bilmədilər. Bir insana, bir rəhbərə və bir xalqa əzəmət bəxş edən budur: düşmənin puç .əzəmətindən qorxmamaq

İslam İnqilabının Böyük Rəhbərinin məhərrəm ayı münasibətilə xalqın müxtəlif .təbəqələrilə görüşdəki çıxışından: ۱۹۹۲

Seyyidüş-şühəda (ə) bilirdi ki, şəhid olandan sonra düşmən cəmiyyətdə və ozamankı dünyada onun əleyhinə təbliğat aparacaq. İmam Hüseyn (ə) elə bir şəxs deyildi ki, zamanı və düşməni tanımasın. O, düşmənin hansı xəbisliklər törədəcəyini bilirdi. Eyni zamanda inamı və ümidi vardı ki, onun bu məzlumcasına və qəribcəsinə hərəkəti .nəhayət düşməni həm qısa və həm uzun müddət üçün məğlub edəcək; elə də oldu

İmam Hüseynin (ə) məğlub olduğunu düşünmək səhvdir. Öldürülmək məğlub olmaq deyil. Müharibədə öldürülən şəxs məğlub sayılmır, öz məqsədinə çatmayan şəxs məğlub sayılır. İmam Hüseynin (ə) düşmənlərinin məqsədi İslamı və Peyğəmbərin (s) yadigarlarını yer üzündən silmək idi. Onlar məğlub oldular; çünki belə olmadı. İmam Hüseynin (ə) məqsədi isə İslam düşmənlərinin hər yeri istədikləri rəngə boyamaqdan ibarət olan yekdil proqramını iflasa uğratmaq, İslamın, onun məzlumluq və haqlılıq nidasının hər yerdə ucalması və nəhayət İslam düşməninin məğlub olması idi. Və belə .də oldu

.İmam Hüseyn (ə) həm qısa müddət üçün qalib oldu, həm də uzun müddət üçün

İslam İnqilabının Böyük Rəhbərinin məhərrəm ayı münasibətilə xalqın müxtəlif .təbəqələrilə görüşdəki çıxışından: ۱۹۹۲

Qısa müddət üçün belə oldu ki, bu qiyamın, o həzrətin məzlumcasına şəhadətinin və ailəsinin əsir olmasının özü

Bəni-Üməyyə hökumətini zəiflətdi. Həmin hadisədən sonra İslam dünyasında – Mədinədə və Məkkədə bir-birinin ardınca bəzi hadisələr baş verdi və nəhayət Əbu Süfyan sülaləsinin məhvinə səbəb oldu. Üç-dörd ildən sonra Əbu Süfyan sülaləsi tamamilə sıradan çıxdı. Kim təsəvvür edərdi ki, İmam Hüseyni (ə) Kərbəlada məzlumcasına şəhid edən bu düşmən o imamın fəryadının əks-sədasına bu şəkildə məğlub olsun; özü də üç-dörd ildən sonra?! İmam Hüseyn (ə) uzun müddət üçün də qalib oldu. Siz İslam tarixinə baxsanız, görərsiniz ki, dünyada din nə qədər inkişaf etdi, İslam dini nə qədər kök saldı, İslam xalqları necə yarandılar və inkişaf etdilər, İslam elmləri necə inkişaf etdi, İslam fiqhi necə inikşaf etdi və nəhayət, əsrlər ötdükdən sonra bu gün İslam bayrağı dünyanın ən uca yerlərindən birində dalğalandı.

İslam İnqilabının Böyük Rəhbərinin məhərrəm ayı münasibətilə xalqın müxtəlif təbəqələrilə görüşdəki çıxışından: ۱۹۹۲.

Allah yolunun dünya qarşısında elə məzlumcasına dayanan, qanı tökülən, ailəsi əsir alınan mübarizi və mücahid şəxsi öz düşməninə qələbə çaldı. Bu, xalqlar üçün bir dərsdir. Buna görə müasir dünyanın hətta bəziləri müsəlman olmayan böyük rəhbərlərindən nəql edirlər ki, biz mübarizə yolunu Hüseyn ibn Əlidən (ə) öyrəndik. Bizim öz inqilabımız həmin nümunələrdən biridir. Bizim xalqımız da Hüseyn ibn Əlidən (ə) öyrəndi; anladı ki, öldürülmək məğlub olmaq demək deyil; anladı ki, zahirən qüdrətli düşmən qarşısında geri çəkilmək fəlakətə və bədbəxtliyə bais olur. Düşmən nə qədər əzəmətli olsa da, mömin cinah və mömin tərəf Allaha təvəkkül edib onun qarşısında cihada qalxsa, nəhayət düşmən məğlub olacaq və möminlər qalib. Bunu bizim xalqımız da anladı.

İslam İnqilabının Böyük Rəhbərinin məhərrəm ayı münasibətilə xalqın müxtəlif təbəqələrilə görüşdəki çıxışından: ۱۹۹۲.

Kərbəla bizim daimi örnəyimizdir. Kərbəla düşmənin əzəməti qarşısında insanın tərəddüdə düşməməsi üçün bir misaldır. Bu, sınaqdan çıxmış bir örnəkdir. Düzdür, erkən İslam çağında Hüseyn ibn Əli (ə) ٧٢ nəfərlə şəhadətə qovuşdu, lakin mənası bu deyil ki, kim Hüseynin (ə) yolunu gedirsə və kimlər mübarizə aparırlarsa, mütləq şəhid olmalıdırlar. Xeyr, İran xalqı Allahın lütfü ilə bu gün Hüseynin (ə) yolunu təcrübə edib İslam xalqları və dünya xalqları arasında başucalığı və əzəmətlə yaşayır. Sizin inqilabın qələbəsindən öncə getdiyiniz yol Hüseyn (ə) yolu - yəni düşməndən qorxmamaq və qüdrətli düşmənlə mübarizəyə girmək idi. Müharibə dövründə də belə oldu. Bizim xalqımız bilirdi ki, onun qarşısında Şərq və Qərb dünyası və bütün imperializm dayanmışdır. Lakin qorxmadı. Düzdür, biz dəyərli şəhidlər verdik, əzizlərimizi itirdik, bizim əzizlərimiz sağlamlıqlarını əldən verdilər, əlil oldular, bəzi əzizlərimiz bir neçə il əsirlikdə qaldılar, bəziləri hələ də Bəs rejiminin zindanlarındadır. Lakin xalq bu fədakarlıqlarla izzət və əzəmətin zirvəsinə çatmışdır, İslam izzətli olmuşdur, İslam .bayrağı ucalmışdır. Bu sözügedən müqavimətə görədir

İslam İnqilabının Böyük Rəhbərinin məhərrəm ayı münasibətilə xalqın müxtəlif .təbəqələrilə görüşdəki çıxışından: ١٩٩٢

O müqavimət bu gün də vacib və zəruridir. Bu gün hegemonçu Amerika İran xalqını və bütün dünyada mübariz müsəlman xalqları öz gücündən qorxutmaq istəyir. Şərq bloku dağılandan sonra onun parça-parça olmuş bir çox hissələri zəiflik səbəbindən özlərinin dünənki düşmənlərinə təslim oldular, onlara üz tutdular, bir çox ölkələrdəki iradəsiz xalqlar Amerika dövlətinin boyunduruğu altına düşdülər. Bu gün Amerikanın öz dostlarına və əlaltılarına diktə etdiyi siyasət budur ki, hegemonluğun mütləq hökmranlığı yolunda olan hər hansı bir müqavimət məhv edilməlidir. Deyirlər ki, indi bir çox dövlətlər bizə təslim olmuşlar, nə üçün İslam tərəfdarları təslim olmurlar, nə üçün İran xalqı təslim olmur. Müsəlman

xalqları qorxutmaq istəyirlər. Bu gün elə bir gündür ki, müsəlman xalqlar imperializmin zahiri iqtidarı qarşısında qorxuya və tərəddüdə düşməməlidirlər. Bu mübarizə davam .edir

İslam İnqilabının Böyük Rəhbərinin məhərrəm ayı münasibətilə xalqın müxtəlif .təbəqələrilə görüşdəki çıxışından: ١٩٩٢

**.Bu xalq tarixi keçmişli və böyük xalqdır**

Biz altmış milyona yaxın əhalisi, potensial imkanları olan və dünya coğrafiyasının həssas mövqeyində yerləşən böyük bir ölkədə yaşayırıq. Biz elə bir xalq deyilik ki, böyük güclər bizi təhdid edib qorxuda və öz qanadları altına sala bilsinlər. Xalq və hökumət əl-ələ verib bu ölkədə mövcud olan müxtəlif imkanlarla bu ölkəni qurmalıdırlar. Bu ölkə iranlının əli ilə qurulmalıdır, qeyri-iranlıya etimad etmək olmaz. Uzun illər qeyri-iranlılar müxtəlif adlarla - müstəşar və digər adlarla gəlib bu ölkəyə xəyanət etmişlər. Hökumət xalq üçün, xalq hökumət üçün və hökumətin arxasında olmalıdır, hamı əl-ələ verməli, müxtəlif təbəqələr çiyin-çiyinə dayanıb hegemonluğun və böyük şeytanın gözünə tikan kimi batmalıdırlar. Onların İran xalqına tamah salmalarına icazə vermək olmaz. Və bu, İmam Hüseynin (ə) ruhu sayəsində, Aşuranın .ruhu sayəsində mümkündür

İslam İnqilabının Böyük Rəhbərinin məhərrəm ayı münasibətilə xalqın müxtəlif .təbəqələrilə görüşdəki çıxışından: ١٩٩٢

Əza məclisləri ondan ötrüdür ki, bizim qəlblərimizi Hüseyn ibn Əli (ə) və o həzrətin məqsədləri ilə tanış etsin. Bəzi anlamaz adamlar deməsinlər ki, İmam Hüseynin (ə) yolu bütün İran xalqının öldürülməsidir. Hansı nadan insanın belə söz deməsi mümkündür?! Bir xalq Hüseyn ibn Əlidən (ə) dərs almalıdır - yəni düşməndən ,qorxmamalıdır, özünə güvənməlidir, öz Allahına təvəkkül etməlidir; bilməlidir ki

əgər düşmən əzəmətlidirsə, bu əzəmət sarsılandır; bilməlidir ki, düşmənin cəbhəsi zahirən böyük və güclü olsa da, həqiqi qüvvəsi azdır. Məgər görmürsünüzmü, ۱۴ ilə !?yaxındır düşmənlər İslam Respublikasını məhv etmək istəyirlər, amma bacarmırlar

Bu onların zəifliyindən və bizim qüdrətimizdən başqa nədir?! Biz güclüyük, İslamın sayəsində bizim qüdrətimiz var, Böyük Allaha təvəkkül edir, Ona arxalanırıq. Yəni .bizdə ilahi qüvvə var. Dünya belə bir qüvvənin qarşısında dayana bilməz

İslam İnqilabının Böyük Rəhbərinin məhərrəm ayı münasibətilə xalqın müxtəlif .təbəqələrilə görüşdəki çıxışından: ۱۹۹۲

İmam Hüseyni (ə) şəhadət günəşi, məzlumcasına və qəribcəsinə cihadın günəşi adlandırmaq olar. Bu günəş Hüseyn ibn Əlinin (ə) və onun dostlarının vasitəsi ilə işıq saçdı. Zaman ötdükcə bu nurlu günəşin sönməz çöhrəsinin daha artıq aşkarlanması, .Aşuranın faydalarının daha çox bəlli olması duyulur

Bu hadisənin baş verdiyi ilk gündən onun köklü təsirləri tədricən bəlli olmuşdur. Həmin .günlərdən bəzi şəxslər üzərlərinə müəyyən vəzifələrin düşdüyünü hiss edirlər

Təvvabin (tövbə edənlər) hadisəsi baş verdi, Bəni-Haşim və Bəni-Həsən (ə) ailəsinin uzun mübarizələri qarşıya çıxdı, sonra hətta Bəni-Üməyyə əleyhinə Bəni-Abbas hərəkatı baş qaldırdı; hicrətin ikinci əsrinin ortalarında ozamankı İslam dünyasının bütün bölgələrinə, xüsusən də İrana, İranın şərqinə - Xorasana və digər yerlərə dəvətçilər göndərib zalım, hegemon və millətçi Əməvi hökumətinin məhvinə zəmin .yaratdılar

İslam İnqilabının Böyük Rəhbərinin məhərrəm ayı ərəfəsində ruhani və vaizlərlə .görüşdəki çıxışından: ۱۹۹۵

Doğrudur ki, bu gün düşmənin təbliğatı bütün bəşəriyyətin beyin fəzasını bürümüşdür. .Bunda heç bir şübhə yoxdur

Doğrudur ki, İslamın, xüsusən də şiəliyin simasını ləkələmək üçün çoxlu pullar xərclənir. Doğrudur ki, xalqların və ölkələrin həyatında qanunsuz maraqları olan hər bir kəs özünü İslamın və İslam hökumətinin əleyhinə fəaliyyət göstərməyə borclu bilir. Doğrudur ki, küfr bütün parçalanmasına və qruplara bölünməsinə rəğmən, bütün imkanlardan istifadə edib bir məsələdə yekdil rəyə gəlmişdir. Bu, əsl İslamla düşmənçilikdir. Hətta təhrif olunmuş İslamı da əsl İslamla müharibəyə çəkmiş və meydana gətirmişlər. Bunların hamısı doğrudur. Lakin haqq cinahı və əsl İslam cəbhəsi bu düşmən və xəbis təbliğatlar qarşısında Aşuranın və məhərrəm sözünün ruhu, mesajı və həqiqəti sayəsində həmin möcüzəni bir də təkrar edə bilməzmi?! Nə üçün edə bilməsin?! Çətindir, amma mümkündür, iradə və fədakarlıq lazımdır. Yol açıqdır, .bağlı deyil

İslam İnqilabının Böyük Rəhbərinin məhərrəm ayı ərəfəsində ruhani və vaizlərlə .görüşdəki çıxışından: ۱۹۹۵

!İlahi! Bizim həyatımızı Hüseyn (ə) həyatı, ölümümüzü Hüseyn (ə) ölümü et

İlahi! Bizi bu yola yönəldən Böyük İmamımızı Kərbəla şəhidləri ilə birgə et! Bizim əziz !şəhidlərimizi Kərbəla şəhidləri ilə birgə et

!İlahi! Bizim ölümümüzü öz yolunda şəhidlik et

İlahi! Bu böyük xalqı, bu hüseynçi və aşuraçı xalqı bütün kiçik və böyük düşmənlərinə !qalib, onun düşmənlərini məhv, məyus və uğursuz et

İlahi! Məhəmməd və Ali-Məhəmməd (s) hörmətinə, İslam ümmətini hər yerdə başıuca et, Hüseyn (ə) vəzifəsini onlara öyrət, bu vəzifəni yerinə yetirmək uğurunu onlara əta !et

İlahi! Məhəmməd və Ali-Məhəmməd (s) hörmətinə, dövrümüzün imamının, zamanın vəlisinin qəlbini bizdən razı et! Bizi o həzrətin dostlarından və köməkçilərindən et! O !həzrəti ziyarət etmək səadətini bizə nəsib et

səh:۱۵

İlahi! Məhəmməd və Ali-Məhəmməd (s) hörmətinə, səndən istədiyimiz və istəmədiyimiz xeyirləri bizə bəxş et! Sənə sığındığımız və sığınmadığımız hər bir şərdən !bizi qoru

Hüseyn (ə) hərəkatına əslində iki cür yanaşmaq olar. Onların hər ikisi də düzgündür. Bir yanaşma Hüseyn ibn Əlinin (ə) zahiri hərəkətidir. Bu, fəsadlı, azğın, zalım və qəddar .hökumətin - Yezid hökumətinin əleyhinə bir hərəkətdir

Bu hadisənin əsl həqiqəti isə daha böyük hərəkətdir. İkinci yanaşma insanı buna .yönəldir. Bu, insan cəhalətinin və zəbunluğunun əleyhinə hərəkətdir

Əslində İmam Hüseyn (ə) Yezidlə mübarizə aparsa da, onun geniş və tarixi mübarizəsi .qısaömürlü və dəyərsiz Yezidlə bitmir

.O, insan cəhaləti, aşağılığı, azğınlığı, zəbunluğu və xarlığı ilə mübarizə aparır

.İmam Hüseyn (ə) bunlarla mübarizə aparır

.Böyük Rəhbərin cümə namazı xütbələrindən:۲۰۰۰

İmam Hüseynin (ə) bütün səhabələri şəhid olduqda və ailəsindən başqa heç kəs qalmadıqda Əli Əkbər çadırdan xaric oldu. O ən gözəl gənclərdən biri idi. Atasının yanına gəlib izn istədi. Dedi ki, ata, indi icazə ver mən gedib vuruşum və canımı fəda edim. İmam əsla qarşı çıxmadı və icazə verdi. Bu daha səhabələr, qardaşı, yaxud bacısı uşağı deyil ki, imam “getmə, dayan” - deyə bilsin. Bu onun canının parçası və ciyərparəsidir; getmək istəyəndə icazə verməlidir. Bu, İmam Hüseynin (ə) ehsanıdır. Bu, Hüseynin (ə) ismayılıdır; meydana getmək istəyir. Ona icazə verdi. Əli Əkbər meydana getdikdə İmam Hüseyn (ə) ümidsiz halda ona baxdı. O həzrət ağladı və dedi ki, İlahi, sən şahid ol, mən hər cəhətdən - həm üzdə, həm danışıqda, həm də əxlaqda Peyğəmbərə (s) hamıdan

çox bənzəyən bir gənci döyüşə və ölümə göndərdim. Afərin bu gəncə! Əxlaqı da .Peyğəmbərə (s) daha çox bənzəyir, siması və danışığı da

.(Böyük Rəhbərin cümə namazı xütbələrindən:۱۹۹۵ (Aşura ۱۴۱۶

Mübahilə günü elə bir gündür ki, İslamın əziz Peyğəmbəri (s) özünün ən əziz insanlarını səhnəyə gətirir. Mübahilədə mühüm məqam budur ki, onda özümüz və özünüz, qadınlarımız və qadınlarınız sözləri var. Əziz Peyğəmbər (s) ən əziz insanlarını seçir və haqla batil arasındakı ayrıcın və aydın göstəricinin hamının qarşısında nümayiş etdiriləcəyi mübahisə üçün səhnəyə çıxarır. Belə bir şey görünməmişdi ki, dinin təbliği və həqiqətin bəyanı yolunda Peyğəmbər (s) öz əzizlərinin, övladlarının, qızının, özünün, qardaşı və canişini olan Əmirəl-mömininin (ə) əlini tutub meydana gətirsin. Mübahilə gününün müstəsna olması buna görədir; yəni həqiqətin bəyan olunmasının, həqiqətin çatdırılmasının nə qədər əhəmiyyətli olduğunu göstərir. Meydana gətirib deyir ki, gəlin mübahilə edək, hansımız haqq olsa, qalsın, hansımız haqsız olsa, Allahın əzabı ilə məhv olsun. Həmin məsələ məhərrəmdə əməli surətdə baş verdi. Yəni İmam Hüseyn (ə) də həqiqətin bəyanı və tarix boyu aydınlıq yaratmaq üçün özünün ən əzizlərini götürüb meydana gətirir. İmam Hüseyn (ə) hadisənin necə tamamlanacağını bildiyindən Zeynəbi (ə) gətirdi, öz həyat yoldaşlarını gətirdi, öz övladlarını gətirdi, əziz qardaşlarını .gətirdi

.Hövzə tələbələri və ruhanilərlə görüşdəki çıxışdan: ۲۰۰۹

!Mənim əzizlərim

?İmam Hüseyn (ə) hansı dillə desin ki, sizin vəzifəniz nədir

;Şərait həmin şəraitdir

.Həyat eyni həyatdır; İslam da həmin İslamdır

.Bəli, İmam Hüseyn (ə) bütün nəsillərə praktiki olaraq göstərdi

Əgər İmam Hüseyndən (ə) bir kəlmə də söz nəql olunmasaydı, biz vəzifəmizin nə olduğunu anlamalıydıq.

Əsir olan, zəncirlənən, başçılarının fəsadına düçar olan, din düşmənlərinin hakim olduğu, həyatına və taleyinə qənim kəsildiyi bir xalq hər zaman vəzifəsinin nə olduğunu anlamalıdır.

Peyğəmbərin (s) məsum imam olan övladı belə bir şəraitdə nə etməli olduğumuzu göstərmişdir.

(Aşura ۱۴۱۶ (Böyük Rəhbərin cümə namazı xütbələrindən:۱۹۹۵).

İmam Hüseynin (ə) dövründə İslam imamətini belə bir hala salmışdılar: "Allah bəndələrinə qarşı günah və düşmənçiliklə rəftar olunur". İmam Hüseyn (ə) belə bir vəziyyətin qarşısında mübarizə aparırdı. Onun mübarizəsi demək, aydınlaşdırmaq, hidayət etmək, istər Yezidin dövründə, istərsə də ondan öncə haqq və batilin arasındakı sərhədi müəyyən etmək idi. Yezidin dövründə əlavə olunan bu idi ki, həmin zülm və azğınlıq rəhbəri bu hidayət imamının onun hökumətini imzalamasını istəyirdi. Beyət budur. İmam Hüseyni (ə) məcbur etmək istəyirdi ki, xalqı hidayət etmək və o zalım hökumətin azğınlığından danışmaq yerinə gəlib həmin hökuməti imzalasın və təsdiqləsin. İmam Hüseynin (ə) qiyamı buradan başlandı. Əgər Yezid tərəfindən belə yersiz və axmaq gözlənti olmasaydı, İmam Hüseynin (ə) Müaviyənin dövründəki kimi və özündən sonrakı imamlar kimi hidayət bayrağını ucaltması, xalqı düz yola yönəltməsi və həqiqətləri deməsi mümkün idi.

İslam İnqilabının Böyük Rəhbərinin Dokuhə qarnizonundakı çıxışından: ۲۰۰۲.

**Aşura günündə heç kəs nə baş verdiyini anlamadı.**

O hadisənin əzəməti, Peyğəmbərin (s) ciyərparəsinin, onun dostlarının və yaxınlarının cihadının əzəməti, eləcə də Peyğəmbər (s) övladlarının və əzizlərinin öldürülməsi

faciəsinin əzəməti heç kəsə aydın deyildi. Orada olan şəxslərin əksəriyyəti də .anlamadılar

Düşmən cəbhəsində olanlar o qədər məst, o qədər qafil idilər, insanlıqdan o qədər .uzaqlaşmışdılar ki, nə baş verdiyini anlamadılar

Dünyanın məstləri, qürur, şəhvət, qəzəb və heyvanlıq məstləri insanlıq aləmində nəyin .baş verdiyini anlamırlar

.Zeynəb isə yaxşı anladı

.Səkinə isə yaxşı anladı

.O məzlum qadınlar və qızlar nə baş verdiyini yaxşı anladılar

.Fars vilayətinin əlilləri, fədakarları və şəhid ailələri ilə görüşdəki çıxışdan: ۲۰۰۸

Zeynəb-Kübra müsəlman qadının kamil nümunəsidir, İslamın qadın tərbiyəsi üçün dünya xalqlarına təqdim etdiyi bir örnəkdir. Zeynəb-Kübra çoxcəhətli şəxsiyyətə malikdir; elmli, məlumatlı, uca bilgilərə malik və dəyərli bir insandır. Kim o həzrətlə qarşılaşırsa, onun elmi və ruhi əzəməti qarşısında kiçik olduğunu duyur. Bəlkə də müsəlman qadın şəxsiyyətinin hamıya təqdim edə biləcəyi ən mühüm cəhət İslamdan götürdüyü bu cəhətdir. Müsəlman qadının şəxsiyyəti imana görə, ilahi rəhmətə və əzəmətə könül vermək sayəsində o qədər böyük və əzəmətli olmuşdur ki, böyük hadisələr onun qarşısında kiçik görünür. Zeynəb-Kübranın (ə) həyatında bu cəhət digərlərindən daha aşkar və daha qabarıqdır. Aşura günü kimi bir hadisə Zeynəb-Kübranı (ə) əzə bilmir; Yezid və Übeydullah ibn Ziyad kimi zalım və qəddarların zahiri əzəməti və cah-calalı Zeynəb-Kübranı (ə) təhqir edə bilmir. Zeynəb-Kübra (ə) əzəmətli şəxsiyyətinin vətəni olan Mədinədə, onun qəm-qüssə ocağı olan Kərbəlada, Yezid və Übeydullah ibn Ziyad kimi zalımların sarayında özünün mənəvi əzəmətini qoruyur və .digər şəxsiyyətlər onun qarşısında təhqir olunurlar

İslam İnqilabının Böyük Rəhbərinin xalqın müxtəlif təbəqələrilə görüşdəki çıxışından: .۲۰۰۵

Hüseyn ibn Əli (ə) elə bir iş gördü ki, bütün tağutlar dövründə erkən İslam çağından uzaq olsalar da, zülm və fəsad rejiminə qarşı mübarizə iradələri İmam Həsən Müctəba (ə) dövründən çox olan insanlar peyda oldular; hamısı da yatırıldılar. Mədinə xalqının Hərrə qiyamından tutmuş sonrakı hadisələrə, Təvvabin və Muxtar qiyamlarına, Bəni-Üməyyə və Bəni-Abbas dövrünə qədər xalqların daxilində ardıcıl olaraq qiyamlar baş verdi. Bu qiyamları kim yaratdı? Hüseyn ibn Əli (ə). Əgər İmam Hüseyn (ə) qiyam etməsəydi, tənbəllik və məsuliyyətdən qaçmaq ruhiyyəsi zülmə qarşı barışmazlıq və məsuliyyət hissetmə ruhiyyəsinə çevrilərdimi?! Nə üçün deyirik ki, məsuliyyət hissetmə ruhiyyəsi ölmüşdü? Ona görə ki, İmam Hüseyn (ə) İslam böyüklərinin övladlarının mərkəzi olan Mədinədən Məkkəyə getdi. Abbasın övladı, Zübeyrin övladı, Ömərin övladı, İslamın ilk xəlifələrinin övladları Mədinədə toplaşmışdılar, amma .onların heç biri həmin qanlı və tarixi qiyamda İmam Hüseynə (ə) kömək etmədi

Böyük Rəhbərin ۳ şaban (İmam Hüseynin (ə) doğum günü) münasibətilə Keşikçilər .Korpusu və polis qüvvələri görüşdəki çıxışından: ۱۹۹۳

İmam Hüseynin (ə) qiyamı başlanmazdan öncəyə qədər xüsusi adamlar addım .atmağa hazır deyildilər

İmam Hüseynin (ə) qiyamından sonra isə bu ruhiyyə canlandı. Bu, Aşura macərasında .və digər dərslərin yanında bilməli olduğumuz böyük bir dərsdir

Bu macəranın əzəməti budur: o həzrətin doğulmasından öncə yer və göy onun üçün .ağladı

Bu böyük matəmə görə Hüseyn ibn Əliyə (ə) diqqət yetirdilər, onun əzasını saxladılar, .bu duanın, yaxud ziyarətin təbirincə, ona ağladılar. Bu ona görədir

Böyük Rəhbərin ۳ şaban (İmam Hüseynin (ə) doğum günü) münasibətilə Keşikçilər .Korpusu və polis qüvvələri ilə görüşdəki çıxışından: ۱۹۹۳

İmam Hüseyn (ə) əbədi olaraq haqq bayrağı kimi qalmalıdır. Haqq bayrağı batil sırasında dayana bilməz, batilin rəngini götürə bilməz. Buna görə İmam Hüseyn (ə) buyurdu ki, zillət bizdən uzaqdır. İmam Hüseynin (ə) hərəkəti izzət hərəkəti idi; yəni haqqın izzəti, dinin izzəti, imamətin izzəti, Peyğəmbərin (s) təqdim etdiyi yolun izzəti. İmam Hüseyn (ə) başucalığının tərənnümü idi, möhkəm dayandığından fəxrə də səbəb oldu. Bu, Hüseyn (ə) izzəti və fəxridir. Bir zaman bir şəxs bir söz deyir; sözü demiş və məqsədinə nail olmuşdur. Lakin o sözün üstündə durmur və geri çəkilir. Bu daha fəxr edə bilməz. Fəxr sözünün üstündə duran, ucaltdığı bayrağı tufanların məhv etməsinə və yatırmasına qoymayan insana, xalqa və qrupa məxsusdur. İmam Hüseyn (ə) bu bayrağı möhkəm saxladı, əzizlərinin şəhidliyinə və şərəfli ailəsinin əsirliyinə .qədər getdi. Bir inqilabi hərəkətdə izzət və iftixar da budur

.İslam İnqilabının Böyük Rəhbərinin Dokuhə qarnizonundakı çıxışından: ۲۰۰۲

Bizim dövrümüzdə baş verən İslam inqilabı və İslam quruluşu hərəkatı bu yolda idi. Bu hərəkatı başlayanlar nəzərdə tutduqları hökuməti və quruluşu təşkil etmələrini təsəvvür edə bilərdilər, lakin bu yolda şəhid olmalarının, bütün ömürlərinin mübarizədə, çətinlikdə və uğursuzluqda keçməsinin mümkünlüyünü də bilirdilər. Hər iki yol mövcud idi; İmam Hüseynin (ə) hərəkatında olduğu kimi. ۱۹۶۲ və ۶۳-cü illərdə və sonra çətin və qaranlıq illərdə bu həbsxanalarda ürəkləri isidən, onları hərəkətə vadar edən yeganə şölə mübarizəyə iman şöləsi idi, hakimiyyətə çatmaq eşqi yox. Bu yol İmam Hüseynin (ə) yolu idi. Lakin onun iki tərəfi var; zaman və məkan şəraiti fərqlidir. Bir zaman imkanlar yaranır və İslam hakimiyyətinin bayrağı ucalır. Bir zaman da bu

.imkanlar yaranmır və şəhadətlə sonuclanır. Tarixdə bu qəbildən olanlarımız çoxdur

İslam İnqilabının Böyük Rəhbərinin İslam Respublikası quruluşunun məsul şəxsləri ilə .görüşdəki çıxışından: ٢٠٠٢

Ərbəin (İmam Hüseynin (ə) şəhidliyinin qırxıncı günü) Kərbəla hadisəsində bir başlanğıc idi. Kərbəla hadisəsi - o böyük faciə baş verəndən, Əbu Abdullahın (ə) səhabələrinin, dostlarının və ailəsinin o məhdud mühitdə fədakarlığı həyata keçəndən sonra əsirlər qiyamın mesajını təbliğ etməli idilər. Həzrət Zeynəbin (ə) və İmam Səccadın (ə) xütbələri, ifşaları və həqiqəti söyləmələri güclü bir media qurumu kimi düşüncəni, hadisəni və məqsədi geniş çərçivədə təbliğ etməli idi və etdi də. Qapalı mühitin xüsusiyyəti belədir; xalq anladığı həqiqətləri öz əməllərində göstərməyə macal və cürət tapmır. Çünki əvvəla zalım və müstəbid hakimiyyət xalqı anlamağa və əgər anlamışlarsa, anladıqlarına əməl etməyə qoymur. Kufədə, Şamda və yolda çoxları Zeynəb-Kübranın, yaxud İmam Səccadın (ə) sözlərindən və yaxud əsirlərin vəziyyətindən çox şeyi başa düşdülər. Lakin o zülm, hegemonluq, diktatura və qapalı rejim qarşısında anladığını büruzə verməyə kim cürət göstərərdi və kimin buna imkanı çatardı?! Bu, möminlərin boğazında bir düyün kimi qalmışdı. Bu düyünə Ərbəin .günündə birinci lanset toxundu; Ərbəin günündə Kərbəlada ilk coşqu yarandı

.Şərqi Azərbaycan əhalisi ilə görüşdəki çıxışından: ٢٠٠٩

Bir gün İmama (İmam Xomeyni (r.) dedilər ki, əgər siz bu hərəkatı davam etdirsəniz, Qum Elmi Hövzəsini tətil edəcəklər. Burada söhbət candan getmirdi ki, imam mənim canımı alsınlar, bunun əhəmiyyəti yoxdur - desin. Çoxları canlarından keçməyə hazırdırlar, lakin sizin bu addımınızla Qum Elmi Hövzəsinin tətil edilməsi mümkündür - desələr, geri çəkilərlər. Lakin imam qorxmadı, yolu dəyişmədi və irəliyə getdi. Bir gün imama dedilər ki, əgər bu yolu davam

etdirsəniz, bütün böyük alimləri və təqlid müctəhidlərini sizin əleyhinizə təhrik edə bilərlər; yəni İslam dünyasında ixtilaf yaranar. Burada çoxları geri çəkilər, lakin imam geri çəkilmədi, yolu davam etdirdi və inqilabın qələbəsinə nail oldu. Dəfələrlə imama deyildi ki, siz İran xalqını Pəhləvi rejimi qarşısında müqavimətə çağırırsınız, bəs tökülən qanların cavabını kim verəcək? Yəni imamın qarşısında gənclərin qanlarını qoydular. ۱۹۶۳, yaxud ۶۴-cü ildə böyük alimlərin biri mənim özümə bunu dedi ki, o - yəni imam ۱۵ xordadda (۵ iyunda) bu hərəkəti başlayanda bizim ən yaxşı gənclərimiz öldürüldülər, bunların cavabını kim verəcək? Bu növ təfəkkür tərzləri vardı. Bu təfəkkür tərzləri təzyiq göstərirdi və hər bir kəsi hərəkətdən daşındıra bilərdi. Lakin imam möhkəm dayandı. Onun ruhunun əzəməti, ona hakim olan agahlığın əzəməti belə yerlərdə .görünür

Böyük Rəhbərin İmam Xomeyninin məqbərəsindəki izdihamlı toplantıda çıxışından: .۱۹۹۶

Diqqət yetirin, qardaşlar və bacılar! Bu mühüm məsələdir. Kərbəla hadisəsinə bu baxışla diqqət yetirmək lazımdır. Əgər İmam Hüseyn (ə) Əli Əsğərin şəhidliyi, qadınların əsir olması, uşaqların susuzluğu, bütün gənclərin öldürülməsi və Kərbəlada baş verən çoxlu faciələr kimi çox acı və çətin hadisələrə adi bir dindar gözü ilə baxıb öz missiyasının əzəmətini unutsaydı, addım-addım geri çəkilib deyə bilərdi ki, daha vəzifəmiz yoxdur, indi Yezidlə beyət etməliyik, çarə yoxdur, zərurətlər çətinlikləri halallaşdırır. Amma İmam Hüseyn (ə) belə etmədi. Bu o həzrətin müqavimətinin göstəricisidir. Müqavimət budur. Müqavimət hər yerdə çətinliklərə dözmək mənasında deyil. Çətinliklərə dözmək böyük insan üçün şəriət meyarları ilə, el adətləri ilə və sadə əqli meyarlarla məsləhətin əksi görünən məsələlərə dözməkdən daha asandır. .Bunlara dözmək digər problemlərə dözməkdən çətindir

Böyük Rəhbərin İmam Xomeyninin məqbərəsindəki izdihamlı toplantıda çıxışından: .۱۹۹۶

## Şiəlik – məhəbbət məzhəbi

Şiəlikdə təbliğat məhəbbət və eşq əsasında aparılır. Şiəlik məhəbbət məzhəbidir və məhəbbət şiəliyin özəl xüsusiyyəti. Şiəlik kimi məhəbbətlə əlaqədar olan az məktəb, məslək, din, ayin və təriqət tapmaq olar. Şiəliyin kökü məhəbbət zülalındadır, təvəlla və təbərra, sevgi və nifrət dinidir. Onda eşq və məhəbbət düşüncə və ağılla uyğun və çiyin-çiyinədir, iman duyğusal bağlılıqla yanaşıdır. Şiələrin etiqad və imanları hərəkət və əməl məqamında lazımi təsiri belə kəsb edir. Həmin qəribə və sehrli xüsusiyyət bütün sərt müxalifətlərə və geniş düşmənçiliklərə rəğmən, belə bir məktəbin və .təfəkkürün bu günə qədər yaşamasına bais olmuşdur

Əhli-beyt (ə) məhəbbəti İslam təfəkküründə ən üstün dərəcəli məhəbbətdir və bu fəxr şiəyə məxsusdur. Bu məhəbbətin zirvəsi həzrət Əbu Abdullaha (ə) hörmət və eşqdə təzahür olunub, Aşura və Kərbəla hadisəsində - ən yaxşı Allah adamlarının fədakarlığı macərasında şiə tarixi və mədəniyyəti üçün yadigar qalmışdır. Tarix boyu ruhani və din təbliğatçıları dini həmin hadisənin sayəsində qorumuşlar. İndi də belədir. Əbu Abdullahın (ə) əza çadırı din təbliğatı məclisi, inancların və ilahi hökmlərin bəyan edildiyi və xalqa moizə olunduğu yerdir. Təbliğatçılar məhərrəm və səfər aylarında xalqın hisslərini dinə və imana sarı yönəldirlər. Hətta ramazan ayında Allah ziyafəti də Əbu Abdullahın (ə) məhəbbət çadırında keçirilir, bu ayın mənəvi bərəkətləri və nuru İmam Hüseynə (ə) təvəssül süfrəsində paylanır. İlin digər günlərində də təbliğat məclisləri və minbərlər, hansı adla və hansı bəhanə ilə olsa belə, irfan və .qəhrəmanlığın bu əzəmətli binası sayəsində qurulur

Əsrlər boyu və son bir neçə əsrdə bizim cəmiyyətimizdə dinə dair bu baxış və bu xatırlatma Hüseyn ibn Əlinin (ə) adı ilə bağlı olmuş və müəyyən həddə dini xalqın yaddaşında saxlamışdır. Bu geniş kanal inqilabda işə yaradı. Bizim Aşura hadisəsinə əsaslanan inqilab təfəkkürümüz bütün ölkəyə çəkilmiş bu nizam-intizamlı kanallarla hər yerə yayıldı və xalqı səhnəyə çıxardı. Əgər bizim ölkəmizi bu məsələdə digər

müsəlman ölkələri ilə müqayisə etsəniz, İmam Hüseynin (ə) adının yaşanmadığı yerdə açıq fərqi müşahidə edərsiniz. Bu bizim cəmiyyətimizə özəl xüsusiyyətlər bəxş .etmişdir

Tərəf-müqabili düzgün bəndəlik yolunda irəliyə aparmaq üçün təbliğat üç yönümdə - (mənəvi paklıq üçün) moizə, (xalqın dini məlumatını artırmaq üçün) ilahi bilgiləri izah və müdafiə etmək və (dinləyicilərin böyük məqsədlər yolunda hərəkətinin keyfiyyətini artıran örnək təqdim etmək üçün) həzrət Əbu Abdullahın (ə) dərdli hadisələrini söyləmək və mərsiyələr demək yönümlərində aparılır. Bu baxımdan Əhli-beytə (ə) və özəlliklə İmam Hüseynə (ə) məhəbbət və təvəssül sayəsində təbliğatın davam etməsi nəinki mümkündür, hətta Əba Abdullahın (ə) xatirəsi təbliğatın üç əsas təməlindən .biridir

Həqiqət budur ki, Hüseyn ibn Əli (ə) dünya müqəddəsləri arasında bir günəş kimi nur saçır. Əgər peyğəmbərlər, övliyalar, imamlar, şəhidlər və saleh adamlar ay və ulduzlar .kimi olsalar, bu həzrət dünyaya saçan günəş kimi parlayır

Bu böyüklərin arasında da müəyyən göstəricilər var və şübhəsiz, həzrət Əbu Abdullah (ə) onların ən böyüklərindən biridir. Həqiqətən təkcə bizim kimi kiçik və dəyərsiz insanlar yox, hətta bütün varlıq aləmi - övliyaların, böyüklərin və yaxın mələklərin ruhları da onun nur şüasına möhtacdırlar. Varlığın bizə aydın və tanış olmayan bütün qatlarında Hüseyn ibn Əlinin (ə) mübarək nuru günəş kimi parlayır. Əgər insan özünü .bu günəşin şüası altına salsa, çox dəyərli bir iş görmüş olar

Məsum imamların hər biri malik olduqları bütün əzəmətə və ilahi nura rəğmən, hamını İmam Hüseynə (ə) agah şəkildə təvəssül və diqqət etməyə çağırmışlar. Tarixi baxımdan da bu ad və şəxsiyyət bir tarixi dövr və bir tarix kitabıdır; əlbəttə, sadə və məlumat tarixi mənasında yox, tarixin izahı, təhlili və tarixi həqiqətlərin dərsi .mənasında

Hüseyn ibn Əlinin (ə) həyatında bütün yamacları öz şüası altında saxlayan parlaq bir zirvə vardır və o, Aşuradır. İmam Hüseynin (ə) həyatında o qədər hadisələr, mətləblər, tarix və hədislər var ki, əgər Kərbəla hadisəsi olmasaydı da, o həzrətin

həyatı digər imamların hər birinin həyatı kimi hikmətlərin, əsərlərin, rəvayətlərin və hədislərin mənbəyi olardı. Lakin Aşura hadisəsi o qədər mühümdür ki, siz o həzrətin həyatındakı digər sahə və əlamətləri az xatırlayırsınız. Aşura hadisəsi də çox əhəmiyyətlidir. Hüseyn ibn Əli (ə) barəsində deyilmişdir ki, səma və səmadakılar, yer və yer üzərində olanlar onun üçün ağlamışlar. Hələ bu dünyaya ayaq qoymamış yer və göy Hüseynə (ə) ağlamışdır. Məsələ bu qədər əhəmiyyətlidir. Yəni o gün Aşura macərası və tarixdə bənzərsiz olan böyük şəhadət baş verdi. Bu, gözlərin dikildiyi bir !məsələ idi. Doğrudan, bu necə hadisədir ki, əvvəlcədən təqdir olunmuşdur

Tarix boyu dünyada müxtəlif insanlar qiyam etmiş, müəyyən qruplara başçılıq etmiş, zəhmətlər çəkmiş, nailiyyətlər əldə etmişlər; yaralanmış və öldürülmüşlər. Onların arasında peyğəmbər və imam övladları da az olmamışdır. Lakin Seyyidüş-şühəda özəl bir fərd, Kərbəla hadisəsi də özünəməxsus bir hadisədir. Kərbəla şəhidlərinin digər şəhidlər arasında bənzərsiz yeri var. Görəsən nə üçün? Bu sualın cavabını hadisənin .təbiətində və ruhunda axtarmaq lazımdır

Kərbəla hadisəsi təxminən yarım gündən artıq sürməmişdir. Bir qədər insan şəhid olmuşdur; ya yetmiş iki nəfər, ya bir neçə nəfər az və yaxud çox. Dünyada bu qədər şəhid var. Amma siz Kərbəla məsələsinin olduqca böyük əzəmət kəsb etdiyini görürsünüz. Doğrusu da budur və hələ bundan da əzəmətlidir. Bu hadisə bəşər vücudunun dərinliklərinə belə təsir göstərmişdir. Bu, hadisənin ruhuna görədir. Hadisənin zahiri çox da böyük deyil. Hər halda, kiçik uşaqlar çox yerdə öldürülmüşlər; halbuki orada yalnız bircə altıaylıq körpə öldürüldü. Düşmənlər bəzi yerlərdə qətliam törətmiş və yüzlərlə uşaq öldürmüşlər. Burada söhbət fiziki məsələdən getmir, məna .və ruh baxımından çox əhəmiyyətlidir

Təbliğatçılar öz ilahi vəzifələrini yerinə yetirmək üçün hicrətin ۶۱-ci ilində Kərbəlada baş verən Aşura macərasının şəraitini, məqsədlərini və nəticələrini bilsinlər, onun dərs -və ibrətlərini ayrı-ayrılıqda çıxarsınlar, bundan sonra tərəf

müqabillərinin və müştaq insanların izdihamı qarşısında Şəhidlər ağasının və onun yoldaşlarının başlarına gələn müsibətləri məntiq və emosiya fonunda söyləsinlər, bu macəranın dərs və ibrətlərini yada salsınlar. Bu, ümumi camaat arasında müsibətli .hadisəni söyləmək adlandırılan vəzifədir

**Aşura hadisəsinin baş verdiyi şərait**

Hüseyn ibn Əli (ə) Allahın son elçisi olan həzrət Məhəmməd ibn Abdullahın (s) ikinci nəvəsidir. O, Yəsribdə dünyaya gələn zaman bu şəhər son Peyğəmbərin (s) hicrəti və sükunəti səbəbindən Mədinə Rəsulillah – yəni Allah elçisinin şəhəri adlandırılırdı. Mədinə şəhəri Allah elçisinin Ərəbistan yarımadasında zülmət gecədən də qaranlıq olan o dövrdə İslam adı və İslam bayrağı ilə təsis etdiyi ideal və işıqlı hökumətin .mərkəzi idi

Bəşəriyyət zülmə, cəhalətə və ayrıseçkiliyə düçar olmuşdu. Dünyanın ozamankı Qeysər və Kəsra kimi böyük hökumətlərində - istər ozamankı İranda, istərsə də ozamankı Roma imperiyasında aristokratiya, qeyri-xalq hökuməti, məntiqsiz xəncər, cəhalət və fəsad hakim idi. Kiçik hökumətlər, misal üçün, Ərəbistan yarımadasında olan isə onlardan da pis idi və cahiliyyət bütün dünyanı bürümüşdü. Bu arada İslam nuru Allah Peyğəmbərinin (s) vasitəsi, ilahi yardım, xalqın əzəmətli və gərgin mübarizələri nəticəsində əvvəlcə Ərəbistan yarımadasının bir bölgəsini işıqlandıra bildi, sonra isə tədricən genişləndi və onun şüası hər yeri bürüdü. Peyğəmbər (s) hökumətinin xüsusiyyəti belə idi: zülmün yerinə ədalətə əsaslanırdı; şirkin və insanın fikir parçalanmasının yerinə tövhidə və Pərvərdigarın müqəddəs zatının bəndəliyinə əsaslanırdı; cəhalət yerinə elm və biliyə əsaslanırdı; insanların bir-birinə kin bəsləməsinin yerinə sevgiyə, xoş münasibətlərə və dostluğa əsaslanırdı. Yəni zahiri və batini bəzənmiş bir hökumət idi. Belə bir hökumətdə yetişən insan təqvalı, iffətli, alim, .agah və fəal olur, kamala doğru gedir

## Peyğəmbər (s) hökumətinin davam etməməsi

Belə bir hökumətdə əziz Peyğəmbər (s) İslam cəmiyyətinin rəhbəri və Allah-Taalanın son elçisi kimi Məkkə və Mədinədən bayraqları bağlayıb müsəlmanlara verirdi. Onlar Ərəbistan yarımadasının uzaq bölgələrinə və Şam sərhədlərinə gedirdilər, Təbuk kimi hadisələrdə Roma imperiyasını təhdid edirdilər, rumlular onların qarşısından qaçırdılar və İslam ordusu qalib qayıdırdı. O zaman İslam cəmiyyətinin məscid və minbərindən Quran səsi ucalırdı, Allahın elçisi (s) öz səsi və nəfəsilə xalqa Allah ayələrini oxuyurdu, .nəsihət verirdi, onları hidayət yolunda sürətlə irəliyə aparırdı

## Müaviyənin hiylələrindən keçid

Əgər Əmirəl-möminin (ə) fitnələrlə keçən və nəhayət onunla Müaviyə arasındakı yarımçıq müharibədə məzlumcasına şəhidliklə sona çatan hökümətinin beşillik qısa dövründən sonra müsəlmanların hakimi və Allahın rəsulunun canişi iddiasında olan Müaviyyənin hiyləgərlikləri və kələkbazlıqları başlandı.Bundan sonra Əbu Abdullahın (ə) ilk on ili öz dövrünün imamı olan böyük qardaşı İmam Həsənin (ə) yanında onun tabeliyində və mütləq itaətində keçdi.İmam Həsən Müçtəba (ə) Əmirəl-mömininin (ə) Siffeyində Müaviyə ilə hiylə və kələk səbəbindən natamam qalan və ardınca xəvaric (separatçılar) fitnəsinin törəndiyi döyüşü fəsad cinahının məhvi ilə sona çatdırmağa çalışırdı. Lakin Müaviyyənin hiylələrinin və ətrafındaklılarının xəyanətinin davam etməsi şəraiti dəyişdirdi.Yeni şəraitdə Müaviyyə ilə döyüşü davam etdirməyin haqq cinahının tam məhvindən və haqq ardıcıllarının bütünlüklə şəhidliyindən başqa bir .nəticəsi olamayacaqdı.Odur ki İmam Müctəbə (ə) Müaviyyə iə sülhü qəbul etdi

Əgər İmam Həsən (ə) sülh etməsəydi, Peyğəmbər (s) ailəsinin bütün şəxsiyyətləri ortadan götürüləcəkdi və İslamın orijinal dəyər sistemini qorumaq üçün bir kəs qalmayacaqdı; hər şey bütünlüklə məhv olacaqdı, İslam yaddan çıxacaqdı və Aşura hadisəsinə də növbə çatmayacaqdı. Əgər İmam

Müctəba (ə) Müaviyə ilə döyüşü davam etdirsəydi və bu, Peyğəmbər (s) ailəsinin şəhadəti ilə nəticələnsəydi, İmam Hüseyn (ə) də həmin hadisədə öldürülməli idi, dəyərli səhabələr də öldürülməli idilər, hücr ibn ədilər də öldürülməli idilər; hamı məhv olmalı idi, fürsətlərdən istifadə edib İslamı özünün dəyər formasında qoruya biləcək .bir kəs qalmayacaqdı

Əgər belə bir qanlı hadisə baş versəydi, Əməvi cinahının təbliğat maşını təhrif və yalanla haqq tərəfdarlarının sözünü və məqsədini gizlədib məxfi saxlayacaqdı. Xalq .İmam Həsənin (ə) və dostlarının haqq olduğunu heç zaman dərk etməyəcəkdi

O zaman təhrif fəsad və palçıq seli kimi İslam cəmiyyətinin zehinlərinə axan ən böyük mənəvi bəla idi. Elə bir dövr idi ki, ozamankı İslam şəhərlərinə, İslam ölkələrinə və xalqlarına İslamın ən böyük şəxsiyyətini lənətləmək sifariş olunurdu. Əgər kimsə Əmirəl-mömininin (ə) imamət və vilayətinin tərəfdarı olması ilə ittiham olunsaydı, təqib .olunurdu

Buna görə Əbu Abdullah Hüseyn (ə) İmam Həsənin (ə) sülh fikrinin müdafiəçilərindən oldu. Əslində bu sülh onların hər ikisinin müştərək qərarı idi. Lakin İmam Həsən (ə) .imam və öndər, Əbu Abdullah (ə) isə onun ardıcılı və tabeliyində idi

Xüsusi bir məclisdə yaxın və dəliqanlı səhabələrin biri İmam Müctəbaya (ə) etiraz edəndə İmam Hüseyn (ə) ona qarşı çıxdı. Heç kəs deyə bilməz ki, İmam Hüseyn (ə) İmam Həsənin (ə) yerində olsaydı, bu sülh baş verməyəcəkdi. Xeyr, bu sülh baş verəndə İmam Hüseyn (ə) İmam Həsənlə (ə) idi. Əgər İmam Həsən (ə) olmasaydı və İmam Hüseyn (ə) yalqız olsaydı da, o şəraitdə yenə həmin iş görüləcəkdi və sülh .bağlanacaqdı

İmam Müctəbanın (ə) şəhidliyi ilə Əbu Abdullah (ə) bu iyirmiillik dövrün ikinci onilliyində haqq tərəfdarlarının imamlığını öhdəsinə götürdü. O, böyük qardaşının yolunu davam etdirməkdə dağ kimi dayandı, polad kimi hiylə pərdələrini yırtdı. Bir tərəfdən ibadət, münacat, təvəssül, Peyğəmbər (s) hərəmində etikaf etmək, mənəvi və ruhani işlər, digər tərəfdən də elm və biliyi yaymaqda və təhriflərlə

mübarizə aparmaqda dayanmadan çalışmaq bu on ildə onun haqqın təbliğinə dair işləridir. O həzrətin tarixdə qalan bəzi sözləri, buyruqları və yaxud alimlərə müraciətləri onun bu sahədə əzəmətli fəaliyyətinin göstəricisidir. Bununla belə, Əbu Abdullah (ə) heç zaman Müaviyənin fəsadlı hökuməti əleyhinə qiyama təşəbbüs göstərmədi, təkcə dillə yaxşı işlərə dəvət etdi. Çünki haqq sözünü qiyam və döyüş yolu .ilə xalqa çatdırmaq üçün münasib şərait yox idi

Müaviyənin ölümündən və Yezidin hakimiyyətinin başlanmasından sonra vəziyyət dəyişdi. Müaviyənin fəsadı və pis işləri az olmasa da, hiyləgərliyinə görə zahirən özünü .qorumağı lazım bilir, bəzi fəsadlarını gizlədirdi. Yezid isə aşkar şəkildə günah edirdi

Müaviyədən sonra elə bir adam hökumət başına gəlmişdi ki, hətta İslamın zahiri əməllərinə də riayət etmir, şərab içir, pis işlər görür, cinsi fəsadları və cinayətləri aşkar şəkildə törədir, Quranın əleyhinə danışır, Quranın və dinin ziddinə açıq şəkildə şeir deyir və aşkar surətdə İslama qarşı çıxır. Onun adı müsəlmanların başçısı olduğundan İslam adını silmək istəmir. O, İslama əməl etmir, İslamı sevmir və ona ürək yandırmır. Dayanmadan qoxumuş su axıdıb ətrafı dolduran bir bulaq kimi onun vücudundan qoxumuş su tökülüb bütün İslam cəmiyyətini dolduracaq. Fəsad içində olan hakim belədir. Hakim zirvənin başında durduğundan onun işləri də həmin yerdə qalmır, adi camaatın əksinə olaraq, axır və bütün zirvəni (və yamacı) bürüyür. Adi camaatın öz yeri var. Lakin yuxarıda olanın, cəmiyyətdə daha uca mövqeyə malik olanın fəsadı və zərəri daha çox olur. Adi insanların fəsadı özlərinə, yaxud bəzi ətraflarına zərər yetirir, başda oturan fəsadlı olduqda isə onun fəsadı daşıb hər yeri doldurur. Necə ki, əgər saleh insan olsa, onun yaxşı işləri hər şeyə təsir edir. Belə fəsadlara malik olan bir şəxs Müaviyədən sonra müsəlmanların xəlifəsi - Peyğəmbərin (s) canişini olmuşdur. !?Bundan böyük azğınlıq ola bilərmi

Əməvi cinahının təbliğat maşını daha Yezidin azğınlığının və fəsadının üstünü örtüb Əbu Abdullahın (ə) haqq sözünü gizlədə bilməzdi və bu, hərəkət və qiyam üçün münasib şərait

yaradırdı. Digər məsələ Yezdin Əbu Abdullahdan (ə) beyət almaqda israrı idi. Bu, Əbu Abdullahın (ə) əvvəllər başqa formada olan islahatçı hərəkətini yeni mərhələyə daxil .etdi

## Əbu Abdullahın (ə) məqsədi

Kərbəla macərası və hicrətin ۶۱-ci ilinin aşurasında o torpaqda baş verən möhtəşəm hadisə o qədər əzəmətli və nurludur ki, ondan sonra həmişə İslam dünyasının və hətta ondan xaricdəki mütəfəkkirlərin müzakirə və tədqiqat mövzusu olmuş, ondan yüzlərlə həmişəyaşar dərs götürülmüşdür. Əbu Abdullahın (ə) bu qanlı və məzlum qiyamda məqsədi bu araşdırmaların ən mühüm mövzusu və Aşuranın ən önəmli dərsidir. Hətta o, Mədinədən Məkkəyə və ondan sonra İraqa sarı hərəkət edəndə də bu sual aktual ?idi ki, bu hərəkət və qiyamda məqsəd nədir

İmam Hüseynə (ə) deyirdilər ki, Mədinə və Məkkədə sizə hörmət olunur; Yəməndə hamı şiədir; kənarda elə yerə gedin ki, sizin Yezidlə, Yezidin də sizinlə işi olmasın; bu qədər müridiniz, bu qədər şiələriniz var, yaşayın, ibadət və təbliğ edin, nə üçün qiyam ?edirsiniz? Məqsəd nədir

Bu önəmli sualdır. Əgər bunun cavabı düzgün izah olunsa, Aşuranın gözəlliyi və həmişəyaşarlığı aydınlaşar, Kərbəla şəhidlərinin özəl və özünəməxsus əhəmiyyətinin səbəbi bilinər. Əlbəttə, bu barədə çox danışılmış, bu hadisədən hər kəs öz dərki qədərincə bir şey anlamışdır. Bəziləri onu hakimiyyəti istəməkdə məhdud etmişlər; bəziləri həzrətin məqsədini digər məsələlərdə kiçiltmişlər; bəziləri də onun .hərəkatından daha böyük məqsədlər tapmış, demiş və yazmışlar

## İki ehtimalın araşdırılması

Şəhidlər ağasının qiyamı üçün deyilən müxtəlif məqsədlər arasında iki ehtimal daha :məşhur və zahirdə həqiqətə daha yaxındır

Birinci ehtimal: Bir qrup belə düşünür ki, Əbu Abdullahın (ə) məqsədi fəsadlı Yezid hökumətini kənarlaşdırmaq, bütün

ictimai və siyasi sahələrdə Peyğəmbər (s) yolunun və imamətin icrası ilə İslam .hökuməti qurmaq olmuşdur

Bu söz yarıdoğrudur; demirəm səhvdir. Bu sözdə məqsəd belə də ola bilər: o həzrət hökumət qurmaq üçün qiyam etdi, amma əgər bunun imkansız olduğunu görsəydi, deyəcəkdi ki, daha olmadı, qayıdaq. Əgər belədirsə, bu səhvdir. Bəli, hökumət məqsədi ilə hərəkət edən şəxs bu işin mümkün olduğu yerə qədər gedir; bu işin həyata keçməsinə ehtimalın mövcud olmadığını gördükdə isə vəzifəsi qayıtmaqdır. Əgər məqsəd hökumət qurmaqdırsa, insan mümkün olana qədər getməli, mümkün olmayan yerdə isə qayıtmalıdır. Əgər bu qiyamda həzrətin məqsədinin düzgün Əli (ə) hökuməti qurmaq olduğunu deyən şəxsin məqsədi budursa, bu, düzgün deyil. Çünki .imamın hərəkətlərinin məcmusu bunu göstərmir

İmamın Mədinədən Kərbəlaya qədər hərəkəti boyunca müxtəlif və bəzən etimadlı insanlar dəfələrlə müxtəlif təhlükələr və hətta öldürülmək ehtimalı üzərində təkid göstərirdilər. Şəhidlər ağası da hər dəfə hərəkətin məqsədinin və onun yerinə yetirilməsinin əhəmiyyətini vurğulayırdı. Odur ki, bu məqsəd bütün Aşura hadisəsini .əhatə edə bilməz

İkinci ehtimal: Bir qrup insan düşünür ki, Əbu Abdullahın (ə) məqsədi hökumət məsələsi deyildi. Çünki o, Yezidi devirib hakimiyyətə gələ bilməyəcəyini bilirdi. O .ümumiyyətlə şəhid olmaqdan ötrü qiyam etdi

Bu söz də bir zaman dillər əzbəri idi. Bəzi şəxslər bunu gözəl poetik təbirlərlə bəyan edirdilər. Həzrətin şəhid olmaqdan ötrü qiyam etməsi sözü yeni söz deyil; hətta mən gördüm ki, bizim bəzi böyük alimlərimiz də bunu buyurmuşlar. Onlara görə İmam Hüseyn (ə) buyurub ki, yaşamaqla bir iş görmək olmur, gedib şəhid olmaqla bir iş .görək

Bu iddianın qarşısında demək lazımdır ki, müqəddəs şəriətdə şəhadətin mənası gedib .özünü ölümə atmaq deyil; bizim dini mətnlərimizin heç birində belə bir tövsiyə yoxdur

Bizim müqəddəs şəriətdə tanıdığımız, hədislərdə və Quran ayələrində gördüyümüz şəhadətin mənası budur ki, insan vacib olan, yaxud tərcih edilən müqəddəs məqsədə

çalışsın və o yolda özünü ölümə də atsın. Bu, düzgün İslam şəhadətidir. Lakin insanın ümumiyyətlə gedib öldürülüm – deyə yola düşməsi, yaxud “mənim qanım zalımın ayağını sürüşdürəcək və o yıxılacaq!” kimi şairanə təbir (İslamda yoxdur).

Deməli, Əbu Abdullahın (ə) öz dostları ilə birgə şəhidliyə can atması üçün vacib və tərcihli bir məqsəd olmaldır.

**Məqsəd, yoxsa nəticə**

Bu iki ehtimalın heç biri bu əzəmətli hadisəni izah edən məqsəd deyil. Nə demək olar ki, həzrətin bu qiyamdakı məqsədi hökumət qurmaq olmuşdur, nə də demək olar ki, o, şəhid olmaq üçün qiyam etmişdir. Əslində “məqsəd hökumət idi” və yaxud “məqsəd şəhadət idi” deyən şəxslər məqsədlə nəticəni səhv salmışlar.

Xeyr, məqsəd bunlar deyildi. İmam Hüseynin (ə) başqa bir məqsədi vardı, lakin o məqsədə çatmaq üçün bir hərəkət tələb olunurdu. Bu hərəkət bu iki nəticənin birinə səbəb olacaqdı: hökumət, yaxud şəhadət. İmam Hüseyn (ə) bunların hər ikisinə hazır idi; həm hökumətin işlərini hazırlamışdı və hazırlayırdı, həm də şəhadətin işlərini. Hansı olsaydı da, düzgün idi, eybi yox idi. Amma heç biri məqsəd deyildi, hər ikisi nəticə idi. Məqsəd başqa bir şey idi.

**"Məqsəd Allahın vacib buyurduğu mühüm bir əməli yerinə yetirmək idi!"**

Şəhidlər ağasının özünün və vəfalı dostlarının şəhidliyi ilə nəticələnən qiyam və hərəkətdə məqsədi din vacibləri arasında əzəmətli və mühüm bir əməli yerinə yetirmək idi. Bu işin İslamın düşüncə, dəyər və əməl sistemində mühüm yeri var və ondan öncəyə qədər heç kəs onu yerinə yetirməmişdi; nə Peyğəmbər (s) nə Əmirəl-mömininin (ə), nə də İmam Həsən Müctəba (ə).

İmam Hüseyn (ə) bu vacib əməli yerinə yetirməli idi ki, bütün tarix üçün dərs olsun. Məsələn, Peyğəmbər (s) hökumət qurdu və bu işlə təkcə hökumət qurmağın hökmünü gətirmədi,

həm də bütün İslam tarixi üçün örnək göstərdi. Yaxud Peyğəmbər (s) Allah yolunda cihad etdi və bu, müsəlmanların və bəşərin bütün tarixi üçün əbədi dərs oldu. Bu vacib əməl də İmam Hüseynin (ə) vasitəsi ilə yerinə yetirilməli idi ki, müsəlmanlar üçün və .bütün tarix üçün əməli dərs olsun

**İslam iki təhlükə qarşısında**

Keçmişdə görünməyən bu vacib əməlin Əbu Abdullahın (ə) iradə və səyi ilə yerinə yetirilməsi yalnız onun zamanında yaranan şəraitdən irəli gəlirdi. Əziz və ilahi bir fenomen olan İslamı müxtəlif şəraitlərdə təhdid edə bilən iki əsas təhlükə həmin şəraitdə bir-birinin yanında və ən pis formada zahir olmuşdu: biri xarici düşmənlərin .təhlükəsi, digəri isə daxildən məhvolma təhlükəsi

Xarici düşmən bayırdan müxtəlif silahlarla bir quruluşun varlığını, təfəkkürünü, etiqadi təməllərini, qanunlarını və hər şeyini hədəf seçən şəxsdir. Bayırdan nə deməkdir? Mütləq ölkə və quruluşun xaricindən yox, bu, ölkənin daxilində də ola bilər. Özlərini quruluşa yad bilən və ona qarşı çıxan düşmənlər var. Bunlar bayırdadırlar, yaddırlar. Bunlar quruluşu məhv etməyə və dağıtmağa çalışırlar; xəncərlə, odlu silahla, ən müasir texnikalarla, təbliğatla, pulla və ixtiyarlarında olan hər bir şeylə. Bu bir növ .düşməndir

İkinci düşmən və təhdid isə daxildən məhvolma təhdididir; yəni quruluş daxilində olub yadlara məxsus olmayan. Bu, doğmaların təhdididir. Bir quruluşda doğmalar yorğunluq səbəbindən, düzgün yolu dərk etməkdə səhvə yol vermək üzündən, nəfsi duyğulara məğlub olmaqdan, maddi gözəlliklərə baxmaqdan və onları böyük saymaqdan irəli gələrək birdən-birə daxildə təhdid yarada bilirlər. Bunun təhlükəsi birinci təhlükədən daha artıqdır. Hər bir quruluş üçün, hər bir təşkilat və hər bir məsələ .üçün bu iki düşmən - xarici və daxili təhdid mövcuddur

## Dönüşü olmayan yayınma

Bir əziz və ilahi məsələ kimi İslamı təhdid edən bütün təhlükələr İslamın yarandığı zamandan Allah tərəfindən proqnoz edilmiş və o təhlükələrə qarşı tədbir vasitəsi də .İslamın özündə nəzərdə tutulmuşdur

Allah-Taala İslamın müdafiə qüvvəsini onun özündə qoymuşdur; sağlam bir bədən, yaxud sağlam bir maşın kimi; onu düzəldən mühəndis təmir vasitəsini onun öz içinə qoymuşdur. İslam bir fenomendir və bütün fenomenlər kimi onu bəzi təhlükələr təhdid edir. Tədbir görmək üçün bir vasitə lazımdır. Allah-Taala bu vasitəni İslamın özündə .qoymuşdur

O zaman da sözügedən iki təhlükə İslamı təhdid edirdi. Onların hər ikisinin nəticəsi İslam cəmiyyətinin dönüşü olmayan fəlakət və məhvolma yoluna çıxması idi. Çünki fəsadlı hakimlərin varlığına, cəmiyyətin aparıcı və avam insanları arasında fəsad və dünyagirliyin yayılmasına görə İslamın, hökumətin və cəmiyyətin ideal və ilahi vəziyyətə qaytarılması və dirçəldilməsi üçün heç bir maraq və səy göstərilmirdi. .Cəmiyyət azğınlıq içərisində sərgərdan qalmışdı

Əgər əziz Peyğəmbərin (s) bu rels üzərinə çıxardığı bu qatarı bir əl, yaxud bir hadisə relsdən çıxarsa, vəzifə nədir? Əgər İslam cəmiyyəti yoldan yayınsa və əgər bu yayınma elə bir həddə çatsa ki, bütün İslamın və İslam maarifinin yayınma təhlükəsi yaransa, vəzifə nədir? İki növ yayınma və azğınlıq var. Çox zaman xalq fəsada düçar olur, lakin İslam hökmləri məhv olmur. Bəzən də xalq fəsada uğrayır, hökumətlər də fəsada uğrayırlar, alimlər və din natiqləri də fəsada düşürlər. Fəsadlı insanlardan ümumiyyətlə düzgün din sadir olmaz. Onlar Quranı və həqiqətləri təhrif edirlər, yaxşıları pis, pisləri yaxşı, bəyənilməz işi bəyənilən, bəyənilən işi bəyənilməz edirlər, İslamın xəttini ١٨٠ dərəcə dəyişdirirlər. Əgər İslam cəmiyyəti və quruluşu belə bir ?vəziyyətə düçar olsa, vəzifə nədir

İlahi vəzifə İslam hökumətini və İslam cəmiyyətini düzgün və ilahi yola qaytarmaq üçün bütün imkanlardan istifadə etməkdir. Bu, hikmətli Allahın dində qoyduğu vacib .əməldir

Və Əbu Abdullah (ə) İslamın özünü və müsəlman cəmiyyəti təhdid edən bu təhlükələr .qarşısında ona əməl etdi

İslam hər iki təhdidə qarşı yol müəyyənləşdirmiş və cihad təyin etmişdir. Cihad xarici düşmənlərə məxsus deyil: "Kafir və münafiqlərlə cihad et". Münafiq özünü quruluşun daxilinə salır. Odur ki, bunların hamısı ilə cihad etmək lazımdır. Cihad quruluşa etiqadsız və düşmən olması səbəbindən ona hücum etmək istəyən düşmənə qarşı edilir. Həmçinin daxili parçalanma və dağılma ilə mübarizə üçün çox dəyərli olan əxlaq təlimləri mövcuddur. Bu təlimlər dünyanı həqiqi şəkildə insana tanıtdırır və anladır: "Bilin ki, dünya həyatı oyun-oyuncaq, bərbəzək, bir-birinizin qarşısında öyünmək, mal-.“dövləti və oğul-uşağı çoxaltmaqdan ibarətdir

İslam hökmləri məcmusundan olan bu hökmün əhəmiyyəti hökumətin özündən az deyil. Çünki hökumət cəmiyyətin idarəsi deməkdir. Əgər cəmiyyət tədricən xətdən çıxsa, fəsada uğrasa və Allahın hökmü dəyişilsə, vəziyyəti dəyişdirmə və həyatı yeniləmə hökmü, yaxud inqilabın bugünkü təbiri ilə desək, inqilab hökmü olmasa, bu !?hökumət nəyə yarayar

Deməli, azğın cəmiyyəti əsl xəttinə qaytarmağa dair hökmün əhəmiyyəti hökumət hökmünün əhəmiyyətindən az deyil. Bəlkə də demək olar ki, bunun əhəmiyyəti kafirlərlə cihaddan da artıqdır; bəlkə də demək olar ki, bunun əhəmiyyəti bir İslam cəmiyyətində adi formada yaxşı işlərə dəvət etməkdən və pis işlərdən çəkindirməkdən daha artıqdır; hətta bəlkə də demək olar ki, bu hökmün əhəmiyyəti Allahın böyük ibadətlərindən və həcdən də artıqdır. Nə üçün? Ona görə ki, bu hökm əslində İslamın yaşamasını təmin edir; ölmək ərəfəsində olduqdan, yaxud ölüb .ortadan götürüldükdən sonra

İmam Hüseynin (ə) işi xarici düşmənə qarşı - ilahi quruluşdan xaricdə və ona müxalif olan düşmənə, zəruri olaraq sərhədlərdən xaricdə olan düşmənə yox - cihadla yüksək və bənzərsiz həddə nəfsə qapılmağa, fərdi və ictimai azğınlıqlara qarşı cihadı .birləşdirməkdir

Yəni Allah-Taala bilir ki, bu hadisə qarşıya çıxacaq. Buna görə də yüksək səviyyəli bir nümunə təqdim olunmalı və

örnək göstərilməli idi. Necə ki, ölkə çempionları məşğul olduqları idman növündə digərlərinin həvəslənməsinə bais olurlar. Sözsüz ki, bu, izah etmək üçün kiçik bir misaldır. Aşura macərası hər iki cəbhədə əzəmətli bir cihaddan ibarətdir; həm xarici düşmənlə – yəni fəsadlı xilafət aparatı və bu aparata yapışmış dünyagirlərlə, Peyğəmbərin (s) insanların xilası üçün istifadə etdiyi hakimiyyəti İslamın və əziz Peyğəmbərin (s) yolunun əks istiqamətinə aparmaq istəyən şəxslərlə mübarizə cəbhəsində, həm də daxili cəbhədə – yəni o zaman ümumi şəkildə daxili fəsada sarı .hərəkət edən cəmiyyətlə

Sözügedən vacib əməl əslində həmin iki təhlükəni aradan qaldırmaq, İslamı və İslam .cəmiyyətini dönüşü olmayan yayınmadan xilas etmək məqsədi daşıyan bir əməl idi

### Münasib zaman

Şəhidlər ağası münasib şəraitin formalaşması ilə dində və Allah rəsulunun (s) .sözlərində göstərilmiş bu ilahi vəzifəyə əməl edə bilən ilk şəxs idi

Düzdür, Peyğəmbər (s) vəzifənin nə olduğunu buyurmuşdu; Quran da buyurmuşdu. Lakin Peyğəmbər (s) bu ilahi hökmə əməl edə bilərdimi? Xeyr. Çünki Allahın bu hökmü cəmiyyətin yoldan çıxdığı zaman icra oluna bilər. Əgər cəmiyyət yoldan çıxsa, bir iş görmək lazımdır; bu zaman üçün Allahın hökmü var; sapqınlığın yüksək həddə çatıb İslamın özü üçün sapqınlıq təhlükəsi yaratdığı cəmiyyətlərdə Allahın təyin etdiyi vəzifə var. Allah insanı heç bir hadisə qarşısında vəzifəsiz qoymur. Peyğəmbər (s) bu vəzifəni buyurmuşdur, Quran və hədis demişdir. Lakin Peyğəmbər (s) bu vəzifəyə əməl edə bilməz. Nə üçün əməl edə bilməz? Ona görə ki, bu vəzifəyə cəmiyyətin yoldan çıxdığı zaman əməl olunmalıdır. Cəmiyyət Peyğəmbərin (s) və Əmirəl-mömininin (ə) dövründə o şəkildə yoldan çıxmamışdı. İmam Həsənin (ə) dövründə, Müaviyənin hökumət başçısı olduğu zaman o sapqınlığın çoxlu əlamətləri yaransa da, hələ elə .həddə çatmamışdı ki, bütün İslamın təhrifi qorxusu mövcud olsun

Şəhidlər ağasından qabaq belə vəziyyət yaranmışdısa da, o zaman bu işi görmək üçün .münasib imkan və şərait mövcud deyildi

Yaxşı, bu hökmü kim yerinə yetirməlidir? Bu vəzifəni kim icra etməlidir? Peyğəmbərin (s) canişinlərindən biri. Lakin bu şərtlə ki, şərait münasib olsun. Çünki Allah-Taala faydası olmayan bir işi vacib etməmişdir. Əgər şərait münasib olmasa, nə iş görsələr, .faydasız olacaq və təsir bağışlamayacaq. Şərait münasib olmalıdır

Şəraitin münasib olmasının da başqa bir mənası var. Deyə bilmərik ki, təhlükə varsa, deməli, şərait münasib deyil. Xeyr, söhbət bundan getmir. Şərait münasib olmalıdır - yəni insan bilməlidir ki, bu işi gördükdə nəticə hasil olacaq, söz xalqa çatdırılacaq, xalq .başa düşəcək və səhvə düşməyəcək. Bu kiminsə görməli olduğu həmin vəzifədir

İmam Hüseynin (ə) dövründə sözügedən sapqınlıq vücuda gəlmiş və münasib şərait də yaranmışdı. Deməli, İmam Hüseyn (ə) Allahın bu vacib əməlini yerinə yetirmək üçün .addım atmalı idi

Nə üçün bu işi İmam Hüseyn (ə) görməlidir? Ona görə ki, bu vacib əməlin görülməsinə şərait İmam Hüseynin (ə) dövründə yarandı. Əgər bu şərait İmam Hüseynin (ə) dövründə yaranmasaydı, misal üçün, İmam Əli ən-Nəqinin (ə) dövründə yaransaydı, bu işi o görəcəkdi, İslam tarixinin böyük qurbanı İmam Əli ən-Nəqi (ə) olacaqdı. Əgər İmam Həsən Müctəbanın (ə), yaxud İmam Sadiqin (ə) dövründə yaransaydı, onlar buna əməl edəcəkdilər. Bu şərait İmam Hüseyndən (ə) öncə yaranmadı; İmam .Hüseyndən (ə) sonra da qeyb zamanına qədər yaranmadı

### "!Vəzifə təhdidlə boyundan düşmür"

Şəraitin yaranması və münasib fürsətin vücuda gəlməsi vəzifəni yerinə yetirmək yolunda təhlükə və təhdidin olmaması demək deyil. Əbu Abdullahın (ə) hərəkəti onun .üçün, ailəsi və dostları üçün müxtəlif təhlükələrlə dolu idi

Məgər hakimiyyət başında duran şəxsin müxalif insanlara təhlükə yaratmaması mümkündür?! Hər halda, bu bir

mühəribədir. Siz onu hakimiyyət taxtından salmaq istəyirsinizsə, o oturub tamaşa edəcək?! Bəllidir ki, o da sizə zərbə vuracaq. Deməli, təhlükə var. Bəli, İmam Hüseyn (ə) də belə bir vəziyyət qarşısında qalmışdı. Deməli, o vəzifəni yerinə yetirməli idi; şərait münasibdir və heç bir üzr yoxdur. Odur ki, Abdullah ibn Cəfər, Məhəmməd ibn Hənəfiyyə və Abdullah ibn Abbas - bunlar avam deyildilər, hamısı dinşünas, arif, alim və ağıllı insanlar idilər - İmam Hüseynə (ə) “ağa, təhlükəlidir, getməyin” - dedikdə bildirmək istəyirdilər ki, vəzifəni yerinə yetirmək üçün təhlükə yarandıqda o vəzifə boyundan düşür. Onlar anlamırdılar ki, bu vəzifə təhlükə ilə boyundan düşən vəzifə deyil. Bu vəzifə həmişə təhlükəlidir. Ola bilərmi insan zahirən elə iqtidarlı bir hakimiyyətin əleyhinə qiyam etsin və təhlükə olmasın?! Məgər belə bir şey .mümkündür?! Bu vəzifə həmişə təhlükəlidir

Şəhidlər ağası bu təhlükələri bilə-bilə ilahi vəzifəni yerinə yetirməyə qərar verdi. Şərait elə idi ki, bu addım onun şəhidliyi ilə nəticələndi. Halbuki başqa bir şəraitdə zalım hökumətin devrilməsi və ilahi hökumətin qurulması ilə nəticələnməsi də mümkündür. .Hər halda, nəticə fərqinin bu vəzifənin vacib olmasına heç bir təsiri yoxdur

### Digər vəzifələrin mühüm vəzifəyə qurban verilməsi

Hüseyn ibn Əli (ə) öz əməli və sözü ilə anlatdı ki, belə bir şəraitdə İslam dünyası üçün tağut hakimiyyətinə qarşı mübarizə aparmaq və insanları bu hakimiyyətin şeytan .hökmranlığından xilas etməyə çalışmaq ən vacib işdir

### Şəhidlər ağasının məqsədi öz sözlərində

Əbu Abdullahın (ə) məqsədi onun bir çox sözlərində bəyan olunmuşdur. Şəhidlər ağası Mədinədən Kərbəlaya qədər getdiyi yolun müxtəlif mənzillərində bəzi şəxslərə cavabda, yaxud öz müraciətlərində müxtəlif ibarələrlə bu mühüm vəzifəyə işarə .vurmuşdur

Mədinə şəhərinin hakimi olan Vəlid gecə vaxtı imamı çağırıb dedi ki, Müaviyə dünyadan köçmüşdür, siz Yezidə beyət etməlisiniz. Həzrət ona buyurdu ki, qalsın sabaha, gedək fikirləşək, görək biz xəlifə olmalıyıq, yoxsa Yezid. Ertəsi gün Mərvan həzrəti Mədinənin küçələrində görüb dedi ki, Əbu Abdullah, sən özünü ölümə verirsən, .nə üçün xəlifəyə beyət etmirsən? Gəl beyət et, özünü ölümə atma, əziyyətə salma

Həzrət onun cavabında bu cümləni buyurdu: "Biz Allahınıq və Allaha sarı qayıdacağıq. Yezid kimi birisi ümmətin hakimi olacaqsa, İslamla vidalaşmaq lazımdır". Söhbət Yezidin özündən getmir; Yezid kimi kim olursa-olsun. Həzrət demək istəyir ki, indiyədək nə oldusa, dözüləsi idi, lakin indi söhbət İslam dininin və quruluşunun özündən gedir. Bu, Yezid kimi birisinin hökuməti ilə bu məhv olacaq. O, sapqınlıq təhlükəsinin ciddi təhlükə olduğuna işarə vurur. Məsələ İslamın özü üçün təhlükədən .ibarətdir

## Məhəmməd Hənəfiyyəyə vəsiyyət: Allahın vacib buyurduğu əməli yerin yetirmək üçün qiyam etmək

Həzrət Əbu Abdullah (ə) həm Mədinədən, həm də Məkkədən xaric olanda Məhəmməd ibn Hənəfiyyənin o həzrətlə söhbətləri olmuşdur. Həzrət qardaşı Məhəmməd ibn .Həfiyyəyə bir vəsiyyət yazdı

Orada Allahın birliyinə və digər məsələlərə şəhadətdən sonra deyilir: "Mən nə azğınlığa, nə təkəbbürlülüyə, nə də fəsad və zülm törətməyə görə qiyam edirəm". Yəni kimlərsə səhv etməsinlər, təbliğatçılar təbliğat aparmasınlar ki, İmam Hüseyn (ə) də hakimiyyəti ələ keçirmək, özünü göstərmək, eyş-işrət, zülm və fəsad üçün qiyam .edən şəxslər kimi mübarizəyə və döyüşə gedir. Bizim işimiz bu tipdən deyil

Bu işin adı islah etməkdir; islah etmək istəyirəm. Bu, İmam Hüseyndən (ə) öncə görülməyən vacib əməldir. Bu islahetmə qiyam yolu ilə baş verir. Xüruc - qiyam deməkdir. Həzrət bu vəsiyyətnamədə bunu qeyd edir. Yəni əvvəla qiyam etmək istəyirik və bizim bu qiyamımız da islah üçündür, mütləq

hakimiyyətə yiyələnmək üçün deyil, mütləq gedib şəhid olmaq üçün deyil. Xeyr, biz islah etmək, düzəltmək istəyirik. Əlbəttə, islah etmək kiçik iş deyil. Bəzən şərait elə olur ki, insan hakimiyyətə gəlir və özü işləri idarə edir. Bəzən də bu işi görə bilmir, .mümkün olmur və şəhid olur. Eyni zamanda bunların hər ikisi islah üçün qiyamdır

Sonra buyurur: "Mənim bu hərəkətdə məqsədim cəddimin ümmətini islah etmək, yaxşı işlərə dəvət və pis işlərdən çəkindirməkdir. Mən cəddimin və atamın yolu ilə getmək istəyirəm". Bu islah yaxşı işlərə dəvət etməyin və pis işlərdən çəkindirməyin .nümunəsidir

## Bəsrə böyüklərinə məktub: Sünnəni dirçəltmək və bidəti ortadan götürmək

Həzrət Məkkədə iki məktub yazmışdır :biri Bəsrə şəhərinin böyüklərinə, biri də Kufə şəhərinin böyüklərinə.Həzrət Bəsrə böyüklərinə yazdığı məktubda deyir ki, mən bidəti ortadan götürmək və sünnəni dirçəltəmək istəyirəm, çünki sünnəni öldürmüş və bidəti diriltmişlər.Əgər mənim arxamca gəlsəniz, doğru yola qovuşarsınız . Yəni İslamı diriltməkdən, Peyğəmbər sünnəsini və İslam quruluşunu diriltməkdən ibarət olan .böyük vəzifəni yerinə yetirmək istəyirəm

## Kufə böyüklərinə məktub :Hökümətin imamətə qaytarılması

Kufə əhalisinə yazdığı məktubda isə buyurdu ki, İslam cəmiyyətinin imamı, rəhbəri və başçısı günah, xəyanət və fəsad sahibi və Allahdan uzaq bir şəxs ola bilməz. O, Allahın kitabına əməl edən şəxs olmalıdır; yəni cəmiyyətdə buna əməl etməlidir, özü xəlvət bir otaqda yalnız namaz qılmamalıdır. Kitaba əməl etməyi cəmiyyətdə dirçəltməlidir, ədalətlə rəftar etməlidir, haqqı cəmiyyətin qanunu etməlidir. Yəni haqq dini cəmiyyətin qayda və qanunları etməli, batili kənara qoymalıdır. Nəyin bahasına olursa-olsun, özünü Allahın doğru yolunda qorumalı, maddi və şeytani gözəlliklərin əsiri

.olmamalıdır. Vəssəlam. Görürük ki, burada məqsədi müəyyən edir

**Düşmənə müraciət: Peyğəmbər (s) hökmünə əməl etmək**

Hürr ibn Yezidlə birgə – həzrət hara gedirsə, o da yanında hərəkət edir – Beyzə adlı bir yerə çatdılar. Bəlkə də istirahətdən öncə, yaxud bir qədər istirahət etdikdən sonra həzrət ayağa qalxıb düşmən ordusuna müraciətlə buyurdu: "Ey insanlar həqiqətən Allahın Rəsulu (s) buyurmuşdur: "Kim Allahın haramını halal edən, Allahın əhdini sındıran, Peyğəmbər (s) sünnəsinə qarşı çıxan, Allahın bəndələrinə qarşı günah və düşmənçilik edən zalım bir hökmdarla üzləşsə, əməli və ya sözü ilə ona etiraz etməsə, Allahın haqqıdır ki, bu şəxsi də o zalımı daxil etdiyi yerə (cəhənnəmə) daxil etsin". Yəni Allah-Taala qiyamətdə bu sakit, laqeyd və bir iş görməyən şəxsi o zalımı düçar etdiyi taleyə düçar edəcək; onunla bir sırada və bir cinahda duracaq. Qabaqca qeyd etdi ki, bu məsələnin hökmünü Peyğəmbər (s) buyurmuşdur. Bu qeyd etdiyimiz nümunələrdən biridir. Peyğəmbər (s) İslam quruluşunun yoldan yayındığı təqdirdə nə etməyin lazım olduğunu müəyyənləşdirmişdi. İmam Hüseyn (ə) də Peyğəmbərin (s) həmin buyruğuna istinad edir. Deməli, vəzifə nədir? Vəzifə sözlə və əməllə vəziyyəti dəyişdirməkdir. İnsan belə bir şəraitə düşdükdə və sözsüz ki, münasib bir zamanda bu əməlin qarşısında qiyam etmək və addım atmaq vacibdir; nəticə nə olursa-olsun; öldürülsün, sağ qalsın, zahirən uğur qazansın, yaxud qazanmasın. Bu vəziyyətin qarşısında olan hər bir müsəlman qiyam etməlidir. Bu, Peyğəmbərin (s) buyurduğu .vəzifədir

Sonra İmam Hüseyn (ə) buyurdu ki, mən bu qiyama və bu işə bütün müsəlmanlardan daha layiqəm; çünki mən Peyğəmbər (s) övladıyam. Əgər Peyğəmbər (s) bu dəyişdirmə işini bütün müsəlmanlara vacib etmişdirsə, bəllidir ki, Peyğəmbər (s) oğlu, Peyğəmbər (s) elminin və hikmətinin varisi olan Hüseyn ibn Əliyə (ə) digərlərindən daha vacib və

daha münasibdir. Və mən bunun üçün hərəkət etdim. Burada da imam öz qiyamının .səbəbini bəyan edir

**!Əzyəd mənzili: Nəticə bu vəzifəyə təsir etmir**

Dörd nəfərin İmam Hüseynə (ə) qoşulduğu Əzyəd mənzilində buyurdu ki, and olsun Allaha, mən Allahın bizim vasitəmizlə istədiyi xeyri arzulayıram; istər öldürülək, istər zəfər çalaq. Yəni istər qələbə çalsınlar, istər öldürülsünlər, fərqi yoxdur, vəzifə vəzifədir və icra olunmalıdır. Buyurdu ki, mən Allah-Taalanın bizim üçün nəzərdə tutduğunun bizim xeyrimizə olduğuna ümidvaram; istər öldürülək, istər qələbə çalaq, .fərqi yoxdur. Biz vəzifəmizi yerinə yetiririk

**Kərbəlanın ilk xütbəsi: Haqqa əməl etmək və batilin qarşısını almaq**

Kərbəla torpağına daxil olduqdan sonra belə buyurdu: "Görmürsünüz ki, daha haqqa "...!?əməl olunmur və batildən çəkindirilmir

**Əbu Abdullahın (ə) qiyamının nəticəsi**

Bəlidir ki, əgər iman iddiaçıları İmam Hüseynə (ə) qarşı ayrı cür rəftar etsəydilər, birinci nəticə (qələbə və hakimiyyət) hasil olardı. Bu həmin dövrdə xalqın dünya və axirətini düzəldə bilərdi və Peyğəmbər (s) dövründə olduğu kimi, imaməti fəsadlı və fəsad .törədən şahlığın yerinə qoyardı

Əbu Abdullahın (ə) qiyamı zahirdə düşmən qoşunları ilə döyüşməklə, onun və dostlarının şəhid, ailəsinin və digər yoldaşlarının əsir olması ilə nəticələndi. Lakin !?demək olarmı bu aqibət Şəhidlər ağasının məğlubiyyəti və düşmənin qələbəsi idi

Məsələnin zahiri belədir ki, dövrün ən dəyərli insanları Aşura hadisəsində məhv edildilər. Hüseyn ibn Əli (ə) ailəsinin bütün görkəmli şəxsiyyətləri və gəncləri ilə - qeyrətli səhabələri, qardaşları, övladları, yaxınları və gəncləri ilə birgə çox qərib şəkildə şəhidliyə qovuşdu və çox qərib şəkildə də dəfn olundu; nə kimsə onların cənazəsini müşayiət elədi və nə

kimsə onlar üçün əza saxladı. Kərbəlanın sağ qalmış yeganə kişisi olan İmam Səccad (ə) da o zamandan ٣٤ il sonraya qədər Mədinədə zahiri təcrid halında yaşadı; nə .qoşun, nə toplum, nə hay-küy vardı

Maddi məntiqlə hökumət edən maddi güclərin yanlış təsəvvürü adətən belədir ki, bunlar bitdilər və məhv oldular. Lakin görürsünüz ki, həqiqət belə deyil. Bunlar bitmədilər. Bunlar qaldılar; əzəmətləri, gözəllikləri və təsirləri günbəgün artdı, qəlbləri fəth etdilər. Bu gün şiə və qeyri-şiə olan yüz milyonlarla müsəlman bunların adına təbərrük edir, sözlərindən bəhrələnir və xatirələrini uca tuturlar. Bunlar tarixdə .qələbədir; həqiqi və həmişəyaşar qələbə

## İslamın keşiyini çəkmək

Əbu Abdullahın (ə) hərəkəti və qiyamı bütün bu düşmənçiliklərə rəğmən, möhkəm bir təməl kimi İslamın dünyada ١٣٠٠ ildən artıq canlı və uca qalmasına bais oldu. Əslində .Hüseyn (ə) Aşurası İslamın yaşamasının ən mühüm amillərindən biridir

Elə bilirsiniz ki, o şəhidlik, o pak qan və elə böyük hadisə olmasaydı, İslam qalardı? Şübhəniz olmasın ki, qalmazdı; şübhəniz olmasın ki, hadisələr tufanında məhv olardı. Ola bilsin tarixi bir din kimi bir qrup zəif tərəfdarla dünyanın harasındasa qalardı, amma canlı İslam qalmayacaqdı. İslamın təkcə adının və xatirəsinin qalması mümkün idi. Amma bu gün görürsünüz ki, İslam ١٤٠٠ ildən sonra dünyada canlıdır, qurucudur. Bu gün İslam dünyada həyatvericidir. Bu gün İslam dünyada xalqları ən aydın və ən işıqlı ümid kimi özünə cəlb edir. Bunların hamısı Kərbəla hadisəsinin və Hüseyn ibn .Əlinin (ə) fədakarlığının nəticəsidir

## Bənzərsiz örnək və həmişəyaşar nümunə

Böyüklərə bənzəmək və övliyalara mənsub olmaq zirəklərin işidir. Hər kəs bir örnək istəyir, bir nümunəni və idealı izləyir. Lakin örnək tapmaqda hamı düzgün yolu seçmir. Xalqlar üçün örnək çox əhəmiyyətli məsələdir. Siz

baxın, müxtəlif xalqların hansısa bir şəxsiyyətində bir əzəmət damlası mövcud olsa, onu mütləqləşdirirlər, böyüdürlər, adını əbədiləşdirirlər; ona görə ki, nəsillərinin ümumi hərəkətini istədikləri istiqamətə yönəltsinlər. Bəzən həqiqi şəxsiyyətləri olmur, amma dastanlarda, şeirlərdə, müxtəlif milli əfsanə və miflərdə olanları ortaya qoyurlar. Bunların hamısı ondan irəli gəlir ki, xalqlar öz daxilindən böyük nümunələr görməyə .ehtiyaclıdırlar

Dünyada bəzi adamlardan hansı şəxsiyyət sizi özünə cəlb edir” – deyə soruşsanız, ömürlərini nəfsə itaətdə keçirən və yeganə hünərləri yalnız qafillərin xoşuna gələn, kiçik və qafil insanları bir neçə anlıq əyləndirən kiçik, dəyərsiz və əskik insanları .göstərəcəklər

Allah övliyalarının ən böyük xüsusiyyəti budur: onlar o qədər şücaətli, güclü və qüdrətlidirlər ki, öz nəfslərinin hakimi ola bilirlər, nəfslərinə əsir olmurlar. Qədim filosof və həkimlərdən biri barəsində deyilənə görə, Makedoniyalı İsgəndərə dedi ki, sən mənim qullarımın qulusan. İsgəndər təəccübləndi və qəzəbləndi. Dedi ki, qəzəblənmə, sən öz şəhvətinin və qəzəbinin qulusan; bir şeyi istəyəndə dözmürsən, bir şeyə əsəbiləşəndə dözmürsən; bu, şəhvət və qəzəb qarşısında köləlikdir. Halbuki şəhvət və qəzəb mənim köləmdirlər. Bu əhvalat doğru, yaxud həqiqətdən uzaq ola bilər. Lakin Allah övliyalarına, peyğəmbərlər və bəşərin ilahi hidayət yolunun bələdçiləri barəsində doğrudur. Onun nümunələri Yusif, İbrahim və Musadır. Allah övliyaları arasında da çoxlu nümunələr vardır. Ən zirək insanlar bu böyük, şücaətli və qüdrətli insanları örnək .seçən və bu yolla özlərinə mənəvi iqtidar və əzəmət qazanan şəxslərdir

Əbu Abdullahın (ə) qiyamı tarix boyu bütün xalqlar qarşısında işıqlı məşəldir; ondan bəhrələnməklə kamal və səadət yolunu tapmalıdırlar. Belə əzəmətli və parlaq bir iş yalnız böyük və nurlu bir varlıqdan baş verə bilər. Əbu Abdullahın (ə) və onun yoldaşlarının Aşura hadisəsindəki rəftarı, sözü, onların şəxsi xüsusiyyətləri bütün əsrlərdə və nəsillərdə zirək və fərasətli insanlar üçün əbədi örnəkdir. Belə parlaq və bənzərsiz örnək bəzi diqqətəlayiq xüsusiyyətlərə

.malikdir. Bunlara Aşura hadisəsi daxilində diqqət yetirilməlidir

**Güclü iradə**

Hüseyn ibn Əli (ə) tarixin ən pak insanlarına mənsub olması ilə bütün kainat önündə fəxr edə bilərdi, lakin heç zaman bu fəzilətlərlə qane olmadı. İlahi fəzilətləri qorumaq .və artırmaq, eləcə də öz vücudunun inkişafı və yüksəlişi üçün daim çalışdı

Diqqət yetirin, İmam Hüseyn (ə) Peyğəmbər (s) övladı idi, Əli ibn Əbu Talibin (ə) və Fatimeyi-Zəhranın (ə) övladı idi. Bunların hamısı bir insanı çox ucaldan dəyərlərdir. O, həmin evdə, həmin qucaqda, həmin tərbiyədə, mənəvi mühitdə və ruhani cənnətdə böyümüşdü. Amma bunlarla qane olmadı. Əziz Peyğəmbər (s) dünyadan köçəndə o ۸-۹ yaşlı bir yeniyetmə, Əmirəl-mömininin (ə) şəhadəti zamanı isə ۳۷-۳۸ yaşlı bir gənc idi. Əmirəl-mömininin (ə) sınaq və fəaliyyətdən ibarət olan imamlığı dövründə bu istedadlı .şəxs onun əli altında mahirləşmiş, güclü, işıqlı və pak olmuşdu

Əgər bizim kimi bir insanın iradəsi olsa, deyər ki, bu qədər bəsdir, bu yaxşıdır və bununla Allahın görüşünə gedərəm. Hüseyn (ə) iradəsi isə belə deyil. Qardaşının mübarək həyatı dövründə onun tabeliyində, İmam Həsən (ə) isə imam olarkən həmin əzəmətli hərəkəti davam etdirdi. Yenə inkişaf, qardaşının yanında, dövrünün imamının mütləq itaətində durub vəzifələrini yerinə yetirmək... Bunların hamısı dərəcə və ucalıqdır. Bütün anlarını hesablayın. Qardaşı şəhid edildikdən sonra bu həzrətin mübarək həyatı on il davam etdi. İmam Həsənin (ə) şəhadətindən İmam Hüseynin (ə) şəhadətinə qədər ۱۰ ildən bir qədər artıq sürmüşdür. Siz görün İmam Hüseyn (ə) .Aşuradan öncəki bu on ildə nə edirdi

Belə böyük bir insanın güclü iradəsi bir an da dayanmamaq üçün örnəkdir. Həmişə inkişaf halında olmaq lazımdır. Çünki düşmən – istər zahiri və maddi düşmən, istər gizli və nəfs düşməni yumşaq torpaq təpəsi arxasında pusqu qurmuşdur və hücum etmək üçün insanın dayanmasını gözləyir. Şəhidlər ağası özünün bütün həyatında göstərdi ki, düşmənin

hücumunu saxlamaq və onun sıralarını pozmaq üçün ən yaxşı yol hücum etmək, yəni .davamlı inkişaf və ilahi dəyərləri əldə etməkdir

**Zamanı tanımaq**

Əbu Abdullah (ə) mövqeyi dərk etməkdə səhvə düşmədi. Kərbəla hadisəsindən öncəki onillik imamət və məsuliyyət dövründə Mədinədə digər işlərlə məşğul idi, Kərbəla işini görmürdü. Lakin şərait münasib olan kimi mövqeyi tanıdı və onu əldən vermədi; digər .işləri buraxıb əsas vəzifəsini yerinə yetirməyə başladı

İmam Hüseynin (ə) yanında olan insanların hər birində bu xüsusiyyət vardı. Onlar zamanı və əsas vəzifəni tanımaqda səhv etmədilər; dostlarından və köməkçilərindən .tutmuş Bəni-Haşimə və Əli (ə) ailəsinə, qardaşı Abbasa və bacısı Zeynəbə qədər

İmam Hüseyn (ə) müqəddəs babası həzrət Məhəmməd ibn Abdullah (s) kimi cəhalət və fəsad dolu bir dünya ilə təkbaşına qarşılaşdı, o həzrətin qorxmayıb dayandığı və irəlilədiyi kimi, Şəhidlər ağası da qorxmadı, dayandı və irəlilədi. Peyğəmbər (s) hərəkəti və Hüseyn (ə) hərəkəti vahid mərkəzdə birləşən iki dairə kimidir və bir səmtə .yönəlmişdir. “Hüseyn məndəndir” sözünün mənası da budur

Hadisənin məğzi budur ki, İmam Hüseyn (ə) bu macərada bir qoşunla üz-üzə dayanmadı, insanların bir toplumu ilə - hətta bir neçə yüz dəfə artıq olsa da - tərəf deyildi. İmam Hüseyn (ə) azğınlıq və zülmətlər dünyası ilə qarşı-qarşıya dayanmışdı. Bu mühüm məqamdır. O bir dünya əyrilik, zülmət və zülmlə qarşılaşmışdı. O dünyanın da hər şeyi vardı: pulu, qızılı, gücü, şeiri, kitabı, rəvayətçisi və axundu. Dəhşətli idi. Adi və hətta qeyri-adi bir insanın bədəni o zülmət dünyasının puç əzəməti qarşısında titrəyirdi. Lakin İmam Hüseynin (ə) ayağı və qəlbi bu dünya qarşısında titrəmədi, zəiflik .və tərəddüd hiss eləmədi və təkbaşına meydana atıldı

İmam Hüseyn (ə) Aşura gecəsi buyurdu ki, gedin, burada qalmayın, mənim uşaqlarımın əlindən də tutun aparın, bunlar məni istəyirlər. O, zarafat etmirdi. Fərz edin onlar qəbul edib

getsəydilər, İmam Hüseyn (ə) tək-tənha, yaxud on nəfərlə qalacaqdı. Elə bilirsiniz İmam Hüseynin (ə) işinin əzəməti kiçilərdi?! Xeyr, elə həmin əzəmətdə qalardı. Əgər İmam Hüseynin (ə) ətrafında bu ٧٢ nəfərin yerinə ٧٢ min nəfər olsaydı, işin əzəməti .kiçilərdi? Xeyr

İşin əzəməti bu idi ki, İmam Hüseyn (ə) təcavüzkar və iddialı bir dünya qarşısında qorxuya düşmədi. Halbuki adi insanlar qorxurlar; adi olmayan insanlar da qorxurlar. Dəfələrlə dediyim kimi, böyük şəxsiyyət olan Abdullah ibn Abbas və Qüreyşin bütün böyüklərinin övladları o vəziyyətdən narazı idilər. Abdullah ibn Zübeyr, Abdullah ibn Ömər, Əbdürrəhman ibn Əbu Bəkr, böyük səhabələrin övladları və bəzi səhabələr bu qəbildəndirlər. Mədinədə çoxlu səhabələr vardı, qeyrətli insanlar vardı. Elə bilməyin ki, onların qeyrəti yox idi. Onlar sonrakı ildə Hərrə hadisəsində Mədinəyə hücum edib hamını qətlə yetirən Müslim ibn Üqbənin hücumu qarşısında dayandılar, vuruşdular, mübarizə apardılar. Elə bilməyin ki, qorxaq idilər. Xeyr, döyüşkən və qorxmaz idilər. Amma müharibə meydanına girmək şücaəti bir şeydir, bir dünya ilə qarşı-qarşıya .gəlmək şücaəti başqa bir şeydir. İmam Hüseyn (ə) ikincisini etdi

### İddiaçıların vəfasızlığı

Hər yeri zülmün və fəsadın bürüdüyü belə bir çirkin dünyada Hüseyn ibn Əli (ə) İslamı xilas etmək, İslam hökumətini və cəmiyyətini diriltmək üçün qiyam etdi. Amma o .böyük dünyada İslamı və həqiqəti müdafiə iddiaçılarının heç biri ona kömək etmədi

Kərbəla hadisəsində isə hadisələrin mehvəri və İslamın hamının qəbul etdiyi əsas məğzi - yəni Hüseyn ibn Əlinin (ə) özü hadisənin içindədir və şəhid olmalıdır. Bunu onun özü də bilir, yaxın səhabələri də. Bu böyük dünyada və bu geniş İslam ölkəsində onların heç bir yerə heç bir ümidləri yoxdur, əsl qəribdirlər. Ozamankı İslam dünyasının bəzi böyükləri Hüseyn ibn Əlinin (ə) öldürülməsinə narahat olmurdular, çünki onu öz dünyalarına təhlükə sayırdılar. Bəziləri isə narahat olur, amma bu işə o qədər də əhəmiyyətli

yanaşmırdılar; misal üçün, Abdullah ibn Cəfər və Abdullah ibn Abbas. Yəni bu qəmli və əzab dolu meydanın xaricindən heç bir ümid gözlənilmirdi. Nə vardısa, bu Kərbəla meydanında idi. Bütün ümidlər bu bir qrupa dikilmişdi, bu qrup da şəhidliyə könül vermişdi. Öldürüldükdən sonra da zahiri meyarlara görə kimsə onlar üçün yas tutmadı. Yezid hər yerə hakim idi. Hətta onların qadınlarını əsir apardılar, uşaqlarına da rəhm etmədilər. Bu meydanda fədakarlıq göstərmək çox çətindir: “Ey Əbu .”Abdullah! Sənin müsibətli günün kimi bir gün yoxdur

Məkkədən İmam Hüseynlə (ə) birgə yola çıxan, yaxud yolda o həzrətə qoşulan mindən artıq insandan Aşura gecəsi az bir hissə qaldı; Aşura günü özlərini həzrətə .çatdıranlarla birgə ٧٢ nəfər oldular

### Sona qədər müqavimət

İmam Hüseynin (ə) Yezid rejiminə və İslam cəmiyyətinin dönüşü olmayan sapqınlığına qarşı mübarizə qərarı verdiyi zamandan problem və təhdidlər biri o birindən sonra özünü göstərdi. Əvvəlcə Yezidə beyət etmədiyi üçün Peyğəmbər (s) şəhərində təzyiqə məruz qaldı, həcc məqsədi ilə Məkkəyə sarı hərəkət etdi. Məkkədə tərəfdarlarının hazırlığını duyduqda qiyam və cihada hazırlaşdı. Lakin ehram paltarlarında gizlədilmiş xəncərlər və düşmənlərin Allahın təhlükəsiz evinə təcavüz qəsdi onu həclə vidalaşmağa və Məkkəni tərk etməyə məcbur etdi. Lakin bu mərhələlərin və ondan sonrakı hadisələrin heç birində Əbu Abdullahın (ə) niyyətində zərrə qədər də tərəddüd .yaranmadı

Böyük işlərdə insanın qarşısına sədd çəkən amillərin biri şəriətdə qəbul olunan üzrlərdir. İnsan vacib işi və boynuna düşən vəzifələri yerinə yetirməlidir. Lakin bu iş böyük bir problemə səbəb olduqda, misal üçün, çoxlu insanlar öldürüləcəksə, daha vəzifəsinin götürüldüyünü düşünür. Siz görün İmam Hüseynin (ə) qarşısında yalnız zahiri görən hər bir insanı daşındıra biləcək nə qədər şəriət üzrləri vardı. Bunlar biri o birisindən sonra qarşıya çıxırdı. Əvvəl Kufə xalqının üz çevirməsi və Müslimin öldürülməsi baş verdi. Fərz

edin burada İmam Hüseyn (ə) deməli idi ki, daha bu, şəriət tərəfindən qəbul olunan üzrdür və vəzifə götürülür; istəyirdik Yezidlə beyət etməyək, lakin belə vəziyyətdə mümkün deyil, xalq da dözmür, deməli, vəzifə üzərimizdən götürülür, məcbur .qaldığımızdan və çarəsizlikdən beyət edəcəyik

İkinci mərhələ Kərbəla hadisəsi və Aşuranın baş verməsidir. Burada İmam Hüseyn (ə) bu məsələyə böyük problemləri bu məntiqlə həll etmək istəyən bir insan kimi yanaşsaydı, deyə bilərdi ki, bu yandırıcı səhrada arvad-uşaqların taqəti çatmaz, deməli, vəzifə götürülür. Yəni təslim olsun və o zamana qədər qəbul etmədiyini qəbul etsin. Yaxud Aşura günü düşmənin hücumu başlayanda və İmam Hüseynin (ə) tərəfdarlarının çoxu şəhid olanda – yəni problemlər özünü daha artıq göstərəndə o həzrət daha mübarizənin mümkün olmadığı aydın oldu – deyib, bununla özünü geri çəkə bilərdi. Yəni İmam Hüseynin (ə) şəhid olacağı və onun şəhadətindən sonra Əmirəl-mömininin (ə) və Peyğəmbərin (s) ailəsinin səhrada naməhrəm kişilərin əlində yalqız qalacağı bəlli olduqda daha namus məsələsi qarşıya çıxır. O, qeyrətli bir insan kimi deyə bilərdi ki, daha vəzifə götürüldü; bəs qadınlar nə olacaq; əgər bu yolu davam etdirsək və öldürülsək, Peyğəmbər (s) ailəsinin qadınları, Əmirəl-mömininin (ə) qızları və İslam dünyasının ən pak, ən təmiz qadınları düşmənlərin - şərəf və ...namusdan bir şey anlamayan veyl kişilərin əlinə düşəcək. Deməli, vəzifə götürüldü

Bir zaman insana deyirlər ki, bu yolla getmə, işgəncə olunman mümkündür. Bəli, güclü insan deyir ki, işgəncə olunum, eybi yoxdur, bu yolla gedəcəyəm. Yaxud deyirlər getmə, öldürülmən mümkündür. Böyük insan deyir ki, eybi yox, qoy öldürülüm, bunun əhəmiyyəti yoxdur. Lakin bəzən öldürülməkdən, işgəncə olunmaqdan və çətinlik çəkməkdən söhbət getmir. Deyirlər ki, getmə, sənin bu hərəkətinə görə bəzi insanların öldürülməsi mümkündür. Burada artıq digərlərinin canından söhbət gedir: "Getmə, sənin getməyinə görə çoxlu qadınlar, kişilər və uşaqlar çətinlik çəkə bilərlər". Burada .canları özləri üçün əhəmiyyət kəsb etməyən şəxslər də dayanırlar

Doğrudan da maraqlıdır ki, Allah-Taala Hüseyn (ə) Aşurasının bu meydanını necə də böyük müsibətlərin məcmusu etmişdir. Böyük insanlar və birinci növbədə həzrət Əbu Abdullah Hüseyn (ə) şərəflə, əzəmətlə, dözümlə və şükürlə bu böyük müsibətlərə tab gətirə bildilər. Hadisənin hər iki tərəfi bəşər tarixində bənzərsizdir. Həm o müsibətlər, o sərtlikdə, o çeşidlikdə və hamının səhərdən axşamüstünə qədər öldürüldüyü müsibətlər dünyada bənzərsizdir, həm də bu müsibətlərin qarşısındakı dözüm tarixdə misilsizdir. O şəhadətlər, o məzlumluqlar, o qürbət hissi, o susuzluq, bir nəfərə ailəsinə görə verilən əzablar, gələcəkdən nigaranlıq, sonra da varlıq aləminin ən əzizinin - yəni Hüseyn ibn Əlinin (ə) yoxluğu, ailəsinin, övladlarının, səhabələrinin yoxluğu və sonra da əsirlik; özü də bir qrup şərəfli insanın əlində əsir olmaq yox. Çünki şərəfli insana əsir düşmək yenə dözüləsidir. O insanlar isə şərəfli insanlar deyildilər, heç insan deyildilər, heyvan xislətli idilər. İmam Hüseynin (ə) ailəsi Aşura səhərindən axşamüstünə qədərki .bütün müsibətlərdən sonra bu şəkildə əsir düşdü

## İxlas və mənəviyyat

Şəhidlər ağası ilahi və insani xislətlərin zirvəsində durub gərgin və yolunu azmış bəşəriyyətə əl tutmaq istəyən müqəddəs varlıqdır. O, kamil insan, ixlaslı və Allah üçün paklanmış bəndədir. O, Allahdan başqa hər bir şeyə göz yummaq yolunda cihad, fədakarlıq, şəhidlik, xarici və daxili düşmənlərlə mübarizə obrazını yaradıb hamıya .göstərdi

İmam Hüseynin (ə) hadisəsi həm düşmənlə, həm də nəfslə cihadın ən yüksək dərəcədə birləşdiyi hadisəsidir. Allah-Taala bilir ki, bu hadisə baş verəcək. Buna görə yüksək nümunə göstərilməli və o yüksək nümunə örnək olmalıdır. Aşura hadisəsi hər iki cəbhədə əzəmətli cihaddan ibarətdir; həm xarici düşmənlə mübarizə cəbhəsində, həm də daxili cəbhədə. O zaman cəmiyyət ümumi şəkildə daxili fəsada sarı hərəkət .edirdi

**Nəfslə mübarizə**

Şəhidlər ağasının hərəkatı haqq və batilin aşkar mübarizəsində ictimai və siyasi cəhətdən daha geniş olan bir mübarizə cəhətinə malikdir və o, insanların nəfsi və daxilidir; zəifliklərin, tamahların, həqarətlərin, ehtirasların və insan vücudundakı nəfs istəklərinin insanı uca addımlardan saxladığı, ikinci dərəcəli vəzifələrin əsas .vəzifələrdən yayındırdığı məqamdır

Bu şəkildə nəfsə qarşı mübarizə və asılılıqlardan qurtuluş Şəhidlər ağasının Aşurasını bənzərsiz və yeganə etdi: “Sənin müsibətli günün kimi gün yoxdur, ey Əbu Abdullah!”. Fədakarlıq bu böyük insanın və onun yoldaşlarının başında böyüklük tacı və o cəmiyyət əvvəldən sona qədər İslamın fəxrləri məcmusu üçün tac dürrü oldu; belə ki, .daha heç kəsi onlarla müqayisə etmək mümkün deyil

**İxlas və həmişəyaşarlıq**

Aşura hadisəsində fədakarlıq, daxili və xarici şeytanlarla mübarizə nümayiş olundu. Bu yalnız Şəhidlər ağasının ixlası sayəsində baş verdi. İxlas – yəni ilahi vəzifəni yerinə yetirmək, şəxsi, qrup və maddi maraqları ona qarışdırmamaqdır. Əgər Əbu Abdullahın (ə) vücudunda ilahi ixlas nuru parlamasaydı və möminlərin həmin az qismini öz şüası .altına salmasaydı, belə bir hadisə həyata keçə bilməzdi

Hüseyn ibn Əlinin (ə) hərəkəti ixlaslı, heç bir niyyətin qarışmadığı, Allah üçün, din üçün və müsəlmanların cəmiyyətini islah etmək üçün idi. Buyurdu: “Mən nə azğınlığa, nə təkəbbürlülüyə, nə də fəsad və zülm törətməyə görə qiyam edirəm“. Özünü göstərmək deyil, özü üçün bir şey istəmək deyil, riyakarlıq deyil. Bu hərəkətdə bir zərrə qədər də zülm və fəsad yoxdur. “Bu qiyamda məqsədim cəddimin ümmətini islah etməkdir“. Bu çox mühüm məqamdır. Yəni başqa heç bir qərəz və məqsəd yoxdur. O, pak niyyəti və günəş kimi zehni bulaşdırmır. Qurani-kərim erkən İslam çağında müsəlmanlara buyurur: “(Ey möminlər!) Yurdlarından təkəbbürlə və özlərini camaata göstərmək üçün

çıxanlar kimi olmayın“. Və İmam Hüseyn (ə) də burada deyir: “Mən nə azğınlığa, nə təkəbbürlülüyə görə qiyam edirəm“. İki xətt var. Orada Quran buyurur ki, qürur, xudpəsəndlik və nəfsə pərəstiş üzündən hərəkət edənlərdən olmayın. Yəni həmin növdən olmayan hərəkət ixlaslıdır. Fəsadlı xətdə olan hərəkətdə yalnız “öz” və yalnız “mən” ortaya qoyulur. Riya özünü bəzəmiş, qiymətli bir ata minmiş, özündən ləl-cəvahirat asmış və meydan sulayaraq daxil olur. Haraya? Döyüş meydanına. Təsadüfən döyüş meydanı da həmin insanın və onlarla onun kimi adamın həlak olacağı meydandır. Belə bir insanın daxil olması bu cürdür. Onda yalnız nəfs var; bu bir .tərəf

Qarşı tərəfdə ən yaxşı nümunə Hüseyn ibn Əlidir (ə). Onda eqoistlik, mənəm-mənəmlik, şəxsi, milli və qrup maraqları yoxdur. Bu, Hüseyn ibn Əlinin (ə) hərəkatının ilk xüsusiyyətidir. Gördüyümüz hər hansı bir işdə ixlasımız nə qədər artıq olsa, o işin dəyəri daha çox olar. İxlasdan nə qədər çox uzaqlaşsaq, xudpəsəndliyə, eqoistliyə, özü üçün işləməyə, özü barədə, şəxsi və milli maraqları barədə fikirləşməyə bir o qədər yaxınlaşmış olacağıq. Tam ixlasla tam eqoistlik arasında geniş bir sahə var. Oradan bu tərəfə sarı nə qədər yaxınlaşsaq, işimizin dəyəri bir o qədər azalacaq, faydası azalacaq, təsir müddəti azalacaq. Məsələnin mahiyyəti belədir. Bir məhsulda qatqı nə qədər çox olsa, bir o qədər tez xarab olacaq; əgər xalis və qatqısız mal olsa, heç zaman xarab olmayacaq. Real nümunələrdən bir misal vuraq: bu ərinti əgər yüz faiz qızıl olsa, xarab olmayacaq, paslanmayacaq, lakin onun tərkibində nə qədər mis, dəmir və bu kimi metallardan olsa, onun xarab olma ehtimalı çox olacaq. Bu ümumi bir .qaydadır

Mənəvi məsələlərdə isə bu tarazlıq olduqca dəqiqdir. Biz maddi və adi baxışımıza görə anlamırıq, lakin mənəviyyət və bəsirət adamları anlayırlar. Bu işin mütəxəssisi, sərrafı və zərgəri Allah-Taaladır: “Həqiqətən (xalisi qatqıdan) ayıran (Allah) çox dəqiqdir”. Əgər bizim işimizdə bir iynə ucu qədər qatqı olsa, həmin işin dəyəri bir o qədər .azalacaq və Allah onun təsirini azaldacaq. Allah-Taala əyarı dəqiq tanıyır

Əbu Abdullah (ə) haqlı olaraq anlamışdı ki, onun və köməkçilərinin sonu şəhid olmaq və qana boyanmaqdır. Lakin yaxşı bilirdi ki, onun yolu və sözü həyata keçəcək, həmişə yaşayacaq. Əsas məsələ də insanın ilahi niyyətinin və məqsədinin həyata keçməsidir. .Əks təqdirdə, ixlaslı insan üçün öz varlığı mühüm deyil

Böyük ariflərin biri bir məktubda yazmışdı ki, fərz edək İslamın Böyük Peyğəmbərinin (s) gördüyü və özünə məqsəd seçdiyi bütün işlər görüləydi, lakin başqa bir şəxsin adı ilə. Bu zaman İslam Peyğəmbəri (s) narazı qalardımı? Deyərdimi başqasının adına çıxdığından bunu etməyəcəyəm? Belə idi? Yoxsa məqsədi bu işlərin görülməsi idi və kimin adına yazılması mühüm deyildi? Deməli, məqsəd mühümdür. İxlaslı insan üçün .şəxsin əhəmiyyəti yoxdur; onun ixlası var

**İrfan və qəhrəmanlıq**

Aşura hadisəsi hər biri bir dağı titrədən və canından keçmiş insanları da dayandıran həssas mövqelərlə və mürəkkəb

hadisələrlə doludur. Əbu Abdullah (ə) bütün bu böyük və ağır hadisələrin qarşısında dayandı, ayağı titrəmədi. Çünki aydın baxışı vardı, agah idi, öz nəfsinə qalib gəlmişdi, Allahın qarşısında kiçilmiş və təslim olmuşdu. Həmin həmişəyaşar və bənzərsiz cihad və şəhadət həmin mənəviyyatın, irfanın, Allahda fani olmağın, məşuqa qarışıb itməyin, özünü Rəbbin müqəddəs zatının iradəsi qarşısında görməməyin məhsuludur. Aşuranın əzəmətli hadisəsinə, böyük qəhrəmanlığına və aşiqanə macərasına aşiq və arif gözlə baxmaq lazımdır ki, Hüseyn ibn Əlinin (ə) bu bir gecə və yarım gündüzdə nə etdiyi və .hansı əzəməti yaratdığı bəlli olsun

Çoxları mömindir, gedib cihad edir və şəhadətə də qovuşurlar. Şəhadətdir və heç bir şeyi əskik deyil. Lakin bir şəhadət də var ki, iman ruhundan artıq, yanğılı bir qəlbdən, Allah yolunda və Rəbbin məhəbbətində dözümsüz və alovlu ruhdan, ilahi zatda və atributlarda qərq olmaqdan qaynaqlanır. Belə cihadın ayrı ləzzəti olur. Bu ona başqa .bir ləzzət bəxş edir, kainata başqa cür təsir göstərir

O əzəmətli hadisəni belə bir şəxsiyyət yaratmışdır. Bu şəxsiyyət Ərəfə kimi bir duada mənəviyyat və irfanın möhtəşəm dərəcələrini nümayiş etdirir. Ərəfə duası özünü Rəbbin müqəddəs zatı qarşısında fani görmək üçün həzrət Haqq-Taalanın lütfünə təvəssüllə və yanıb-yaxılmaqla doludur; Əhli-beyt (ə) Zəburu kimi irfan eşqinin və şövqünün nəğmələri ilə doludur. İmam Səccadın (ə) bəzi duaları sanki onun duasının izahı və şərhidir; yəni o birincidir, bu ikinci. Möhtəşəm və şərafətli Ərəfə duasının, bu həzrətin Aşura ərəfəsindəki sözlərinin və digər yerlərdəki xütbələrinin qəribə mənası .və ruhu var, uca və zərif bilgilərin və mənəvi həqiqətlərin zəngin dəryasıdır

Həmin ruhiyyəni həzrətin öz dövrünün böyüklərinin - İslam böyüklərinin, tabelərin (Peyğəmbər (s) səhabələrini görmüş müsəlmanların) və digərlərinin toplantısında Minada etdiyi müraciətdə müşahidə edirsiniz. Aşura və Kərbəla hadisəsində, qəhrəmanlıq və döyüş meydanı olmasına baxmayaraq, ilk andan mübarək üzünü Kərbəlanın isti qumları üzərinə qoyub: “İlahi sənin qəza və qədərinə razı və əmrinə tabeyəm” - dediyi

son ana qədər zikr, münacat və təvəssül halında olmuşdur. Məkkədən çıxarkən “Kim bizim yolumuzda canından keçir və Allah liqasını vətən seçirsə, bizimlə gəlsin” – dediyi zamandan qətlgah çökəkliyində “Sənin qəza və qədərinə razıyam” - dediyi son ana qədər dua ilə, təvəssüllə, Allahın görüş vədəsi ilə və həmin Ərəfə əhval-ruhiyyəsi ilə yaşayır. Yəni Aşura macərasının özü də bir irfani macəradır. Döyüşdür, öldürmək və öldürülməkdir, qəhrəmanlıqdır - Aşura qəhrəmanlıqları olduqca yüksək səviyyəli nümunədir - lakin siz bu qəhrəmanlığın əsas quruluşuna baxsanız, görərsiniz ki, onda irfan var, mənəviyyat var, münacat və Ərəfə duasının ruhiyyəsi var. Odur ki, İmam Hüseyn (ə) şəxsiyyətinin digər cəhətinə də bu cihad və şəhadət cəhəti kimi əzəmətlə .və onun kimi yüksək şəkildə diqqət yetirilməlidir

Bu tanımanın nəticəsi Allaha etimaddır. Zahiri məsələlərə görə bu şölə Kərbəla səhrasında sönəcək. Bunu Kufədən gələn şair Fərəzdəq və sükut etməyi tövsiyə edən digər şəxslər də görürdülər, yalnız Əbu Abdullah (ə) yox. Lakin Allaha etimad hökm edirdi ki, bu zahiri nəticələrə rəğmən, onun haqq sözünün qalib olacağına əmin olsun. Buna görə buyurdu: “Həqiqətən yalnız bizim qoşunumuz qalibdir”. Allahın bu qalib əsgərlərinin bir çoxu cihad zamanı şəhid olur və məhv edilirlər, lakin eyni zamanda qələbə onlarındır. Həmin ilahi inanc Kərbəla şəhidlərini elə yüksəltdi ki, “qəlblərini zirehlərinin üstündən geyindilər”. Zireh bədəni qorumaq üçündür, lakin onların Allaha .etimadlı və arxayın qəlbləri onların bədənlərini və zirehlərini qoruyurdu

### İzzət və iftixar

Əbu Abdullah (ə) elə bənzərsiz bir vacib əməli yerinə yetirmək üçün qiyam etdi ki, ondan öncə heç zaman buna şərait yaranmamışdı. O, Mədinədən Kərbəlaya uzanan yol boyu həmin vacib əməli özünün məqsədi kimi izah etdi və bu yolu sona qədər davam etdirmək əzmində olduğunu bildirdi. Mübarək boğazından ucalan “Zillət bizdən uzaqdır” fəryadı

tarix boyu izzət və iftixar mənbəyi olan həmin müqavimətin və dirənişin əks-sədası .oldu

İmam Hüseynin (ə) hərəkəti izzət hərəkəti idi; yəni haqqın izzəti, dinin izzəti, imamətin .izzəti və Peyğəmbərin (s) qoyduğu yolun izzəti

İmam Hüseynin (ə) bütün mərhələlərdəki rəftarı izzətlə, başucalığı ilə və eyni zamanda Pərvərdigarın qarşısında mütləq təslimçilik və bəndəliklə doludur; Mədinədə, !Məkkədə, Kufə yolunda və Kərbəlada

Yezidin zalım və qəddar hökuməti öz təbliğatı ilə Hüseyn ibn Əlini (ə) qınayırdı, onun ədalətli quruluşa və İslam hökumətinə qarşı, özü də dünya üçün qiyam etdiyini göstərmək istəyirdi. Bəzi adamlar bu yalan təbliğata inanırdılar. Hüseyn ibn Əli (ə) Kərbəla səhnəsində cəlladlar tərəfindən faciəli şəkildə şəhid edildikdə də onu bir .qələbə və zəfər kimi qeyd etdilər

Buna görə mən dəfələrlə demişəm ki, bizim dövrümüzün şəhidləri Bədr şəhidləri, Hüneyn şəhidləri, Ühüd şəhidləri, Siffeyn şəhidləri və Cəməl şəhidləri ilə müqayisəolunasıdırlar, onların bir çoxlarından üstündürlər, lakin Kərbəla şəhidləri ilə .müqayisəolunası deyillər

Heç kəs Kərbəla şəhidləri ilə müqayisəolunası deyil; nə bu gün, nə dünən, nə İslamın əvvəlindən və nə də Allah-Taalanın bildiyi və istədiyi zamana qədər. O şəhidlər çox .üstündürlər. Əli Əkbər və Həbib ibn Məzahir üçün başqa bir bənzər tapmaq olmaz

Kərbəla bizim daimi örnəyimizdir. Kərbəla insanın düşmənin əzəməti qarşısında .tərəddüdə düşməməsi üçün bir nümunədir. Bu, sınaqdan çıxmış bir örnəkdir

.Aşura hadisəsini həmişəyaşar edən böyük sirr budur...

### Tarix boyüklüyündə Aşura

Məsum imamların həyatında onların İslam quruluşu qurmaq istəyinə və fəaliyyətinə dair çoxlu nümunələr vardır. İmamlar bu mühüm iş üçün müxtəlif nümunələr təqdim .etmişlər. Şəhidlər ağasının qiyamı və hərəkəti bunların ən mühümüdür

İmam Hüseyn (ə) bir vacib əməli yerinə yetirmək üçün qiyam etdi. Bu vacib əməl tarix boyu müsəlmanların hər birinə aiddir. İslam cəmiyyəti quruluşunun köklü bir fəsada düçar olduğunu və İslam hökmlərinin bütünlüklə dəyişmək ehtimalının olduğunu gördükdə hər bir müsəlman qiyam etməlidir; sözsüz ki, münasib şəraitdə, yəni bu qiyamın təsir bağışlayacağı bilindiyi zaman. Sağ qalmaq, öldürülməmək və əziyyət görməmək şərt deyil. Bunlar şərtlərdən sayılmır. Odur ki, İmam Hüseyn (ə) qiyam etdi .və bu vacib əməli əməli surətdə yerinə yetirdi ki, hamıya dərs olsun

Əbu Abdullahın (ə) qiyamından öncə heç kəs bu önəmli işdən xəbərdar deyildi. Çünki Peyğəmbərin (s) dövründə belə bir hərəkətə səbəb yox idi, Əmirəl-mömininin (ə) və İmam Həsənin (ə) dövründə də qarşıya çıxmamışdı. İmam Hüseyn (ə) yaranmış .şəraitdə bu dərsi əməli surətdə bütün nəsillərə göstərdi

Əgər İmam Hüseyndən (ə) bir kəlmə də söz nəql olunmasaydı, biz vəzifəmizin nə olduğunu anlamalıydıq. Əsir olan, zəncirlənən, başçılarının fəsadına düçar olan, din düşmənlərinin hakim olduğu, həyatına və taleyinə qənim kəsildiyi bir xalq hər zaman vəzifəsinin nə olduğunu anlamalıdır. Peyğəmbərin (s) məsum və imam oğlu belə bir .şəraitdə nə etməli olduğumuzu göstərmişdir

Dillə olmurdu. Əgər bunu yüz formada deyib özü əməl etməsəydi, bu sözün tarixdən keçib bu günə çatması imkansız olardı. Təkcə nəsihət etməklə və dillə deməklə tarixdən keçmir; min cür izah edir və yozurlar. Odur ki, əməl olmalıdır; özü də belə böyük bir əməl, çətin bir əməl, İmam Hüseynin (ə) belə möhtəşəm və qəmli .fədakarlığı

Müasir dünyanın hətta müsəlman olmayan böyük rəhbərlərinin belə dedikləri .”söylənilmişdir: “Biz mübarizə yolunu Hüseyn ibn Əlidən (ə) öyrəndik

Hüseyn ibn Əli (ə) bugünkü dünyada ötən əsrlərə nisbətən daha artıq tanınmışdır. Hazırkı dövrün vəziyyəti elədir ki, onun qərəzsiz mütəfəkkirləri və ziyalıları İslam tarixinə baxıb Şəhidlər ağasını görür və ona təzim göstərirlər. Hətta İslamı tanımayanlar da azadlıq, ədalət, izzət, ucalıq və uca insani

dəyərlər prizmasından baxır və İmam Hüseyni (ə) özünün azadlıq istəyində, ədalət istəyində, pisliklərə, çirkinliklərə qarşı mübarizəsində, insan cəhaləti və zəbunluğu ilə .vuruşmasında öz imam və rəhbərləri görürlər

## Aşura dərsləri

Aşura öyrədir ki, dini qorumaq üçün fədakarlıq göstərmək lazımdır; öyrədir ki, Quran yolunda hər şeydən keçmək lazımdır; öyrədir ki, haqq və batilin döyüş meydanında kiçik və böyük, qadın və kişi, qoca və gənc, görkəmli və adi, imam və rəiyyət hamılıqla bir sırada dururlar; öyrədir ki, bütün zahiri gücünə rəğmən, düşmənin cəbhəsi olduqca zəifdir. Necə ki, Bəni-Üməyyə cəbhəsi Aşura əsirlərinin karvanı sayəsində Kufədə iflasa uğradı, Şamda iflasa uğradı, Mədinədə iflasa uğradı və nəhayət bu hadisə Süfyani cəbhəsinin məhvi ilə nəticələndi. Aşura öyrədir ki, dini müdafiədə insan üçün hər şeydən artıq agahlıq lazımdır. Agah olmayanlar aldanırlar. Agah olmayanlar özləri də bilmədən zalım cəbhəsinə keçirlər. Necə ki, İbn Ziyadın cəbhəsində fasiq və .günahkar olmayan, lakin avam olan insanlar da vardı

Bunlar Aşuranın dərsləridir. Sözsüz ki, bu dərslər bir xalqı zillətdən izzətə çatdırmağa yetər. Bu dərslər küfr və imperializm cəbhəsini məğlub edə bilər. Bunlar həyatı islah .edən dərslərdir

Aşura dərsləri fədakarlıq, dindarlıq, şücaət, xeyirxahlıq və Allah üçün qiyam dərsidir, heç bir zaman çərçivəsində həbs olunmayan canlı, əbədi və həmişəyaşar məhəbbət .və eşq dərsidir

## Əbu Abdullahın (ə) qiyamı – İran xalqının örnəyi

Tarixdə Aşuranın təsirləri saysız-hesabsızdır. Onların ən mühüm olanı məzlum Şiə firqəsinin həmişəyaşarlığı və dinamikliyidir. Hüseyn (ə) təlimləri Şiə təlimlərinin əzəmətli bir hissəsini təşkil edir, əməli baxımdan şiələr və Şiə cəmiyyətləri arasında ən hərəkətverici ünsürdür. Bütün tarix

boyu və münasib zamanda hər bir şəxs Əbu Abdullahın (ə) bütün dövrlərdəki insanlara göstərdiyi örnək əsasında qiyam edib İslam quruluşu yaratmağa çalışa bilər. Lakin İmam Hüseyndən (ə) sonra böyük qeyb dövrünün başlanmasına qədər həmin əbədi .örnəyi icra etmək üçün münasib şərait yaranmadı

Bunun nə üçün yaranmamasının təhlili var. Çünki görülməli olan digər mühüm işlər vardı və İslam cəmiyyətində imamların dövrünün sonuna və qeyb dövrünün əvvəlinə qədər belə bir şərait ümumiyyətlə yaranmadı. Bəli, tarix boyu müsəlman ölkələrində belə şəraitlər çox yaranır. Bu gün də bəlkə İslam dünyasında şəraitin yarandığı və müsəlmanların eyni işi görməli olduğu yerlər var. Əgər görməsələr, vəzifələrini yerinə yetirməmiş və İslamı ümumiləşdirməmişlər. Hər halda, bir-iki nəfər məğlub olacaq. Bu dəyişdirmə, qiyam və islahatçı hərəkət təkrar olunsa, şübhəsiz, fəsadın və azğınlığın .kökü kəsiləcək və məhv ediləcək

İnqilabdan öncə bir məclisdə bir məsəl yadıma düşdü və onu dedim. O məsəl .Mövləvinin Məsnəvi əsərində yazdığı tutuquşu hekayəsidir

Bir nəfərin evində bir tutuquşu vardı. Sözsüz ki, bu bir məsəldir və məsəllər həqiqəti izah etmək üçündür. Bir dəfə o, Hindistana getmək üçün ailəsi ilə xudahafizləşdi. Həmin tutuquşu ilə də sağollaşdı, dedi ki, mən Hindistana gedirəm, ora sənin vətənindir. Tutuquşu dedi ki, filan yerə get, mənim qohumlarım və dostlarım oradadırlar. Onlara de ki, sizin biriniz bizim evimizdədir. Mənim vəziyyətimdən onlara danış və de ki, qəfəsdə, bizim evimizdədir. Səndən başqa bir şey istəmirəm. O, səfər əsnasında həmin yerə çatdı. Gördü ki, bəli, ağacların üstündə çoxlu tutuquşu oturub. Onları çağırıb dedi ki, ey əziz, danışan və yaxşı tutuquşular, mən sizə xəbər gətirmişəm. Sizdən biriniz bizim evimizdədir, vəziyyəti də çox yaxşıdır; qəfəsdə .yaşayır, amma çox yaxşı yaşayışı və münasib qidası var. O sizə salam söyləmişdir

Tacir bu sözü deyən kimi, gördü ki, ağacların budaqları üzərində oturmuş həmin tutuquşuların hamısı qanadlarını

çırpıb yerə düşdülər. İrəli getdi, gördü ki, hamısı ölüb. Çox təəssüfləndi və dedi mən nə üçün elə bir söz dedim ki, bu qədər heyvan – misal üçün, beş, on tutuquşu – canlarını .əldən verdilər. Amma daha keçmişdi və bir iş görə bilmirdi

Tacir qayıtdı. Öz evinə çatıb tutuquşunun qəfəsinə sarı getdi, dedi ki, sənin sözünü çatdırdım. Tutuquşu soruşdu ki, nə cavab verdilər. Tacir dedi ki, sənin sözünü eşidən .kimi hamısı ağaclar üzərində qanadlarını çırpdılar və yerə düşüb öldülər

Bu söz tacirin dilindən çıxan kimi bu tutuquşu da qəfəsdə qanadlarını çırpdı və qəfəsin içinə düşüb öldü. Çox təəssüfləndi, narahat oldu. Qəfəsin qapısını açdı. Tutuquşu daha ölmüşdü, saxlamaq olmazdı. Ayağından tutub onu evin üstünə sarı tulladı. Tullayan kimi tutuquşu havada qanad çalmağa başladı və uçub divarın üzərinə qondu. Dedi ki, əziz tacir dost, sənə çox təşəkkür edirəm. Sən özün mənim azadlığıma vasitə oldun. Mən ölməmişdim, özümü ölülüyə vurmuşdum. Bu dərsi həmin tutuquşular mənə öyrətdi. Onlar bildilər ki, mən burada qəfəsdə əsir və dustağam. Hansı dillə mənə deməli idilər ki, xilas olmaq üçün nə iş görüm?! Əməli surətdə bunu mənə göstərdilər: öl ki, yaşayasan. Mən onların mesajını aldım. Bu, uzaq məsafədən – həmin bölgədən .mənə çatan əməli dərs idi. Mən o dərsdən istifadə etdim

Mən o zaman bu sözü eşidən qardaş və bacılara dedim ki, mənim əzizlərim! İmam Hüseyn (ə) hansı dillə deməlidir ki, sizin vəzifəniz nədir. Şərait həmin şəraitdir, həyat .eyni həyatdır, İslam da həmin İslamdır

Müsəlman İran xalqı Şəhidlər ağasının nəslindən olan bir nəfərin rəhbərliyi ilə Hüseynin (ə) yolu – yəni düşməndən qorxmamaq və güclü düşmənlə mübarizəyə atılmaq yolu ilə getdi, başucalığı və əzəmətlə İslam və dünya xalqları arasında İslam .quruluşunu bərqərar etdi

İmam Hüseynin (ə) dövründə görülən işin kiçik forması bizim imamımızın dövründə görüldü. Lakin orada şəhadətlə nəticələndi, burada isə hökumətlə. Bu da odur, fərqi yoxdur. İmam Hüseynin (ə) məqsədi bizim Böyük İmamımızın məqsədi ilə bir idi. Bu .məsələ Hüseyn (ə) inancının əsasıdır

Tarixin dövrləri fərqli olur. Bəzən əlverişli şərait var, bəzən yoxdur. İmam Hüseynin (ə) zamanında var idi; bizim zamanımızda da var idi. İmam da həmin işi gördü. Məqsəd bir idi. Lakin insan bu məqsədə sarı gedəndə, İslamı, İslam cəmiyyətini və İslam quruluşunu özünün düzgün mövqeyinə qaytarmaq üçün batil hökumətin və mərkəzin əleyhinə qiyam etmək istəyəndə bəzən qiyam edən hakimiyyətə gəlir; bu onun bir növüdür. Bizim dövrümüzdə də Allahın lütfü ilə belə oldu. Bəzən də bu qiyam .hakimiyyətlə nəticələnmir, şəhadətlə nəticələnir

Bizim dövrümüzün şəhid anaları həqiqətən Zeynəbin işini gördülər. Mən bir şəhid anaları, iki şəhid anaları, üç şəhid anaları çox görmüşəm, lakin onlardan zəiflik və acizlik duyulanı olmayıb, yaxud az olub. Analar doğrudan da qəhrəman qadınlardır. Bizim şəhid analarımızın əsas örnəyinin Zeynəb-Kübra olduğu görünür. Onun iki gənc .oğlu - Övn və Məhəmməd şəhid oldular, amma həzrət Zeynəb reaksiya vermədi

Allah-Taala bizim imamımızı uca məqama çatdırdı, maddiyyat və hegemonluq dünyasının məhv etmək, unutdurmaq və kiçiltmək istəməsinə rəğmən, onu qorudu, böyütdü və əbədiləşdirdi. Səbəbi bu idi ki, (İmam Hüseyn (ə) hərəkatının) bu üç xüsusiyyəti onda vardı: əvvəla ixlaslı idi və özü üçün heç bir şey istəmirdi; ikincisi öz Allahına etimadı vardı, işin və məqsədin həyata keçəcəyini bilirdi; Allahın bəndələrinə də etimadı vardı; üçüncüsü isə zamanı və mövqeyi əldən vermədi. Lazım olan anda .lazım olan addımı atdı, lazım olan söhbəti etdi, lazım olan işarəni verdi və hərəkəti etdi

Hər iki hərəkətdə aşkar surətdə mövcud olan xüsusiyyətlərdən biri də şücaət və müqavimətdir. Böyük İmam bu iki xüsusiyyətdə İmam Hüseynin (ə) əsl ardıcılı idi. Bu .təkcə inqilabın qələbə çalmasına yox, həm də sonrakı qələbələrə bais oldu

İmama deyirdilər ki, ağa, siz şahla vuruşursunuz, bu təhlükəlidir. İmam bilmirdi ki, ,təhlükəlidir?! İmam bilmirdi ki, Pəhləvi rejiminin təhlükəsizlik orqanları insanı tutur

öldürür, işgəncə verir, insanın dostlarını öldürür və sürgün edir?! İmam bunları !?bilmirdi

İnqilab dövründə və onun qələbəsindən sonra dünya ikiqütblü idi; hər iki qütb İslam hərəkatının və inqilabının düşməni idi. Bu məsələdə birləşmişdilər, yekdil və həmrəy idilər. İmam isə müqavimət göstərdi, geri çəkilmədi, öz sözündən, şüarından, məqsədindən və yolundan dönmədi. İmamın ağzından düşmənlərin istədiyi hətta bir kəlmə söz də çıxmadı. Bu, Hüseyn (ə) müqavimətidir; İmam Hüseyn (ə) müqavimətinin .bugünkü formada olan kiçik bir nümunəsidir

Aşura hərəkatının aydın xətlərindən biri və bəlkə də əsas xətti İmam Hüseyn (ə) müqavimətindən ibarətdir. Bizim Böyük İmamımız öz hərəkatında, şəxsiyyətində və həyatında həmin xətti seçdi və bununla da İslam Respublikasını sığortalaya, düşməni təhdid və təzyiqdən daşındıra bildi. Düşməni başa saldı ki, təzyiqin təsiri yoxdur, təhdidin təsiri yoxdur, hücumun təsiri yoxdur. Bu hərəkət və bu rəhbər elə bir cərəyan .və elə bir şəxs deyil ki, bu sözlərlə getdiyi yolundan dönsün

Mübarizə dövründə və qələbədən sonra müxtəlif insanlar və hətta bəzi mübarizlər müqavimət və hərəkətin davamı üçün sərhəd təyin edir, artan təhdidlərin və düşmənçiliklərin qarşısında razılaşmağı və güzəştə getməyi tövsiyə edirdilər. Onlarda imamın şücaəti yox idi. Dünyada mübarizə və dirəniş adamı olub döyüş səhnəsindən ...qorxmayan adamlar var, lakin

Lakin döyüş meydanına girmək bir şeydir, bütöv bir dünya ilə vuruşmaq şücaəti... başqa bir şeydir. İmam Hüseyndə (ə) ikincisi vardı, ikincisi üçün hərəkət etdi. Buna görə mən dəfələrlə təkid etmişəm ki, bizim Böyük İmamımızın hərəkəti Hüseyn (ə) hərəkətidir. Bizim dövrümüzdə Böyük İmamın işində Hüseyn (ə) hərəkətindən bir damla vardı. İndi bəziləri deyəcəklər ki, İmam Hüseyn (ə) Kərbəla səhrasında susuz şəhid oldu, lakin Böyük İmamımız belə izzətlə hakim oldu, yaşadı, dünyadan köçdü və dəfn edildi. Məsələnin göstəricisi bunlar deyil. Göstərici hər bir şeyi olan bir dünya ilə .vuruşmaqdır

Nə qədər ki, İslam hərəkatının qarşısında düşmən var və nə qədər ki, dünya şeytanlarının istəyinin əksinə olaraq, din və İslam quruluşu ayaqdadır, Şəhidlər ağasına iqtida və İslamın bu həmişəlik keşikçisinin dərslərinə əməl etmək də davam .edəcək

Harada bu qəbildən bir fəsad olsa, İmam Hüseyn (ə) oradadır, öz rəftarı və əməli ilə sizə nə etməli olduğunuzu deyir. Vəzifə budur. Odur ki, İmam Hüseynin (ə) və .Kərbəlanın xatirəsi yaşamalıdır. Çünki bunu öyrədən Kərbəlanın xatirəsidir

Bəzən şəhidin qanını yaşatmağın əziyyəti və zəhməti şəhidliyin özündən az olmur. İmam Səccadın (ə) otuzillik və Zeynəb-Kübranın bir neçə illik əziyyəti bu qəbildəndir. Əziyyət çəkib bu qanı qorudular. Sonra da qeyb dövrünə qədər digər imamlar bu .əziyyəti çəkmişlər

Bizə deyiblər ki, hər il İmam Hüseyn (ə) üçün ağlayın. Ağlamaq bir faciəni canlı yaşatmaqdır; sanki dünən baş vermişdir. ۱۴۰۰ il öncə bir insan şəhid olmuşdur, nə üçün bu gün ona ağlamaq lazımdır? Bizim ağlamağımız bundan ötrüdür ki, onun xatirəsi özünün bütün cəhətləri ilə birgə bizim zehnimizdə, həyatımızda və varlığımızda yaşasın. Əks təqdirdə, onun düşüncəsi və işarəsi də tədricən zəifləyəcək; biz istəsək .də, istəməsək də

Əbu Abdullahın (ə) qiyam hadisələrini deməkdə iki növ qatqı mövcuddur: Biri heç bir düzgün əsası və istinadı olmayan və bütünlüklə rəvasız və yalan olan qatqılardır. Bunları olduqca diqqətlə tanımaq və onlardan çəkinmək lazımdır. Bəzi yanlış sözlər isə hətta bəzi kitablarda da yazılmışdır. Onlar da Hüseyn (ə) hərəkatının məna və .məfhumuna münasib və layiq deyil

Alim və təbliğatçılar çalışmalıdırlar ki, faciə söyləməyi və rövzəni bacardıqları qədər tarixi əsərin üzündən oxusunlar. Bunun üçün ən yaxşı tarix kitablarından biri Lühuf .kitabıdır

Əli ibn Tavus hicrətin altıncı əsrinin böyük Şiə alimlərindəndir. Onun ailəsi hamılıqla elm və din xadimləridir. Onların hamısı, yaxud çoxusu yaxşıdırlar; xüsusən də bu iki qardaş: Əli ibn Musa ibn Cəfər ibn Tavus və

Əhməd ibn Musa ibn Cəfər ibn Tavus. Bu iki qardaş böyük alimlərdən, müəlliflərdən və etimadlı şəxslərdəndirlər. Məşhur Lühuf kitabı Seyid Əli ibn Musa ibn Cəfər ibn Tavusun əsəridir. Bizim minbər alimlərimizin təbirlərində bu kitabın bəzi hissələri eynilə hədis kimi oxunur. Çünki çox əsaslı və mühümdür, şübhəsiz ki, düzgün hədis və .rəvayətlərdən nəql etmişdir

.Bundan əlavə, absurd qatqılar mərsiyə və növhələrin mətnindən çıxarılmalıdır

Tarix elmində isbat olunmuş bir şeyin ziddinə oxumayın. Üstəlik, Seyid ibn Tavusun Lühufunda olan da, hər halda, vahid xəbərdir. Diqqət yetirin ki, oxuduğunuz məntiqli olsun. Əlbəttə, bu o demək deyil ki, insan hər bir məntiqli sözü özündən qurub oxuya .bilər. Xeyr, həqiqət və reallıqlara istinad edin

**Qasim ibn Həsənin (ə) meydana getməsi**

Mən bu gün İbn Tavusun Lühuf kitabının üzündən bir neçə cümlə rövzə oxumaq və bu əzəmətli səhnələrin bir neçəsini siz əzizlərə söyləmək istəyirəm. Qabaqca deyim ki, bu kitab çox mötəbər kitabdır. Bu Seyid ibn Tavus fəqihdir, arifdir, etimadlı adamdır, hamının hörmət göstərdiyi böyük şəxsiyyət və çox böyük fəqihlərin müəllimidir. Özü ədib, şair və çox dəyərli şəxsiyyətdir. O, çox mötəbər və müxtəsər olan ilk məqtəl (İmam Hüseyn (ə) faciəsi) kitabını yazmışdır. Düzdür, ondan öncə çoxlu məqtəllər yazılmışdır. Onun müəllimi olan İbn Nömanın məqtəli var, Şeyx Tusinin məqtəli var, digərlərinin də həmçinin. Ondan öncə çoxlu məqtəllər yazılmışdır. Lakin Lühuf gəldikdə o məqtəllərin təxminən hamısını kölgədə qoydu. Bu çox yaxşı məqtəldir. Onun sözləri .çox yaxşı, dəqiq və müxtəsərdir. Mən indi bunlardan bir neçə cümlə oxuyuram

Bu hadisələrin biri Qasim ibn Həsənin (ə) meydana getməsidir. Bu olduqca möhtəşəm səhnədir. Qasim ibn Həsən (ə) İmam Hüseynin (ə) dəstəsinin yeniyetmələrindən biridir, hələ həddi-büluğa çatmamışdır. Aşura gecəsi İmam Hüseyn (ə) belə bir hadisənin baş verəcəyini, hamının öldürüləcəyini

deyəndə, hamıya getmək icazəsi verəndə, lakin səhabələr qəbul etməyəndə bu ۱۳-۱۴ yaşlı yeniyetmə dedi: “Əmi can, mən də meydanda şəhid olacağam?”. İmam Hüseyn (ə) bu yeniyetməni sınamaq üçün buyurdu ki, əzizim, sənə görə öldürülmək necə bir şeydir. Cavab verdi ki, baldan şirindir. Baxın, bu, Peyğəmbər (s) ailəsinin dəyər sistemidir. Əhli-beytin (ə) tərbiyə etdiyi belədir. Bu yeniyetmə uşaqlıqdan İmam Hüseynin (ə) qucağında böyümüşdü. Yəni atası dünyadan köçərkən təxminən ۳-۴ yaşı vardı. İmam Hüseyn (ə) bu yeniyetməni böyütmüşdür, ondan tərbiyə almışdır. İndi Aşura günü bu yeniyetmə əmisinin yanına gəlir. Orada bu hadisələri yazıb qeyd edən rəvayətçilər vardı. Bu hadisələr orada olan bir neçə nəfərdən nəql olunmuşdur. Onların biri belə deyir: Biz eləcə baxırdıq. Birdən gördük ki, Əbu Abdullahın (ə) çadırları tərəfdən yeniyetmə bir oğlan bayıra çıxdı. Onun üzü ay kimi parlayırdı. Gəldi və .vuruşmağa başladı

Bunu bilin ki, Kərbəla hadisəsinin xırdalıqları da qeyd olunmuşdur: kim hansı zərbəni vurdu, kim birinci vurdu, kim filan şeyi oğurladı; bunların hamısı qeyd olunmuşdur. Misal üçün, imamın köynəyini oğurlayıb aparan şəxsə sonradan köynək oğrusu deyirdilər. Odur ki, xırdalıqlar qeyd olunmuşdur və məlumdur. Yəni Peyğəmbər (s) .ailəsi və onların dostları bu hadisəni tarixdə itməyə qoymamışlar

Zərbə bu gəncin başını yardı.Bu oğlan üzü üstə yerə yıxıldı, ucadan əmisini çağırdı.İbarələrin bu xüsusiyyətlərinə və gözəlliklərinə diqqət edin.Deyir ki, İmam Hüseyn (ə) qırğı kimi özünü bu yeniyetmənin başı üstünə çatdırdı, sonra qəzəbli şir kimi hücum etdi.Əvvəlcə bir xəncər vurub qatili yerə saldı.Bəziləri bu qatili xilas etməyə gəldilər, lakin həzrət onlara hücum etdi Qasim ibni Həsənin (ə) bədəni ətrafında güclü döyüş baş verdi.Gəlib vuruşurdular, lakin həzrət onları geri qovurdu.Meydanın toz-torpağı ətrafı bürüdü.Rəvayətçi deyir ki, bir qədər sonra toz-torpaq yatdı.Bu mənzərəni təsvir etmək insanın qəlbini çox yandırır.Deyir mən baxıb Hüseyn ibni Əlinin (ə) orada gördüm İmam Hüseyn (ə) bu yeniyetmənin başı üstə durub həsrətlə ona baxırdı.O

yeniyetmə də ayaqları ilə yeri eşirdi; yəni can verir ayağını tərpədirdi.İmam Hüseyn (ə) buyurdu ki, səni qətlə yetirənlər Allahın rəhmətindən uzaq olsunlar.Bu çox əzəmətli bir mənzərədir; İmam Hüseyn (ə) bu yeniyetməyə sevgisini, eyni zamanda onun fədəkarlğını, bu yeniyetməni döyüş meydanına göndərməsini, həmçinin bu gəncin ruh böyüklüyünü və onunla belə rəftar edən insanların cəfasını göstərir.

## Haqqında mərkəzi

Allahın adı ilə

Rəhman və Rəhimli olan Allahın adı ilə.Və bütün həmdlər aləmlərin rəbbi olan Allaha .məxsusdur

.Varlıq aləminin Kövsəri olan Həzrəti Fatiməyi Zəhraya (a) təqdim olunur

(Bilən kimsələrlə (alimlər) bilməyənlər (cahillər) eynidirlərmi? (Zümər surəsi, ayə ۹

:Ön söz

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi ۲۰۰۶-cı ildən Mərhum Ayətullah Seyyid Həsən Fəqih İmaminin nəzarəti altında,elmi mərkəzlərdə tanınan görkəmli tələbələrin vasitəsi ilə məzhəb,mədəniyyət və elmi sahələrdə öz fəaliyyətinə .başlamışdır

:Məramnamə

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi təhqiqatçıların dini biliklərə rahət və tez bir zamanda yiyələnmələri üçün hər bir xidməti onların ixtiyarında qərar vermişdir.Və bu sahədə təəssübkeşlikdən,ictimai,siyasi,fərdi cəryanlardan uzaq duraraq yalnız və yalnız elmi sahədə ixlasla öz xidmətini həyata keçirməkdədir.Bu səbəbdən adı çəkilən müəssisə layihəsini həyata keçirmiş.Və tədqiqat üçün nəzərdə tutulmuş kitabları,məqalələri mütəxəssislər və müxtəlif təbəqələrdən olan insanlar üçün,bir neçə dillərdə və formalarda hazırlayaraq,heç bir məbləğ tələb etmədən sosial .medyada istifadəçilərin ixtiyarında qoymuşdur

:Hədəflər

Quran və Əhli beyt mədəniyyətini və maarifini yaymaq.۱

İnsanları,xüsusən gəncləri tam dəqiq şəkildə dini məsələləri araşdırmağa.۲ sövqləndirmək

Telefon,tablet və kompüterlərdə olan faydasız,yararsız mövzuların yerini .۳ faydalı,mənəviyyatlı mövzularla doldurmaq

.Təhqiqatla məşğul olan tələbələrə xidmət etmək.۴

.Kitab və elmi əsərlər oxumaq mədəniyyətini yaymaq.۵

.Müəlliflərin öz elmi əsərlərini digital formada yaymaq üçün onlara şərait yaratmaq.۶

:İcraçılıq

.Qanunla icazəli olan lisenziyaya malik əsərlərin yayımı.۱

.Bu mərkəz kimi xidmət göstərən oxşar mərkəzlərlə əlaqə.۲

.(Paralel xidmətlərdən çəkinmək (başqalarının etdiklərini təkrarlamamaq.۳

.Yalnız və yalnız elmi məsələləri yaymaq.۴

.Nəşriyyatın mənbələrini qeyd etmək.۵

.Qeyd:Kitabda olanlara görə məsüliyyət o kitabı yazan müəllifin öhdəsindədir

:Müəssisənin fəaliyyəti

.Kitabların çapı və nəşri.۱

.Kitab oxumaq müsabiqələrinin təşkili.۲

.Məcazi sərgilərin istehsalı.۳

.Kompüter oyunlarının istehsalı.۴

Qaimiyyə internet saytının yaradılması:www.ghaemiyeh.com.۵

.Sərgi məhsullarının və moizələrin istehsalı.۶

.Şər'i,əxlaqi və etiqadi suallara cavab.۷

.Mühasibat,mətbuat yaratmaq və sms... sistemlərinin layihəsi.۸

.Təlim kurslarının həyata keçirilməsi.۹

Tərbiyəçi şəxslər hazırlamaq üçün təlim kurslarının təşkili.۱۰

Kompüterdə,tabletdə və telefonlarda icrası mümkün olan minlərlə proqramların.۱۱ dünyada məşhur olan səkkiz formada istehsalı

JAVA.۱

ANDROID.۲

EPUB.۳

CHM.۴

PDF.۵

HTML.۶

CHM.۷

GHB.۸

.v.Qaimiyyə kitab bazarı adına dörd market

ANDROID.۱

IOS.۲

WINDOWS PHONE.۳

WINDOWS.۴

deyilənlər müəssisənin veb saytında Fars,Ərəb,İngilis və Azərbaycan dillərində pulsuz

.istifadəyə verilmişdir

:Sonunda

Mərcəi təqlid müctəhidlərin dəftərxanalarından (ofis),müəssisələrdən,nəşriyyatçılardan,müəlliflərdən və əməyi olan bütün şəxsiyyətlərdən bizlərə hədəfə çatmaqdan ötrü yardım etdikləri üçün səmimi qəlbdən .təşəkkür edirik

:Mərkəzin ünvanı

İsfahan-Əbdurrəzzaq küçəsi-Hacı Muhəmməd Cəfər adına bazar-Şəhid Muhəmməd Həsən Təvəkküli küçəsi-blok۱۲۹/۳۴-birinci mərtəbə

veb sayt:www.ghbook.ir

mail:Info@ghbook.ir

mərkəzin ofis telefonu: ۰۰۹۸۳۱۳۴۴۹۰۱۲۵

Tehran ofisi: ۰۰۹۸۲۱۸۸۳۱۸۷۲۲

Biznes və alqı satqı: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

Mərkəzdə çalışan insanlarla əlaqə yaratmaq üçün nəzərdə tutulan nömrə: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹